# İmam Hüseynə (ə) əza saxlamaq bidətdirmi?

**“Həzrət Vəliyyi-əsr (ə.f)” müəssisəsinin “Şübhələrə cavab” təhqiqat qrupu**

**Tərcümə: Fərhad Mirzə**
**Redaktə: 313news.net**
**Dizayn: Tural Tağısoy**

**Bakı - 2014**

## Bağışlayan və Mehriban Allahın adı ilə

Tarix boyu daim sələfilər (yəni, vəhhabilər) tərəfindən İmam Hüseynin (ə) qiyamının və o Həzrətə (ə) əza saxlamağın əleyhinə şübhələr ortaya atılmışdır. Onlardan biri də azadlıqsevərlərin sərvəri olan İmam Hüseynə (ə) əza saxlamağın bidət hesab olunmasıdır. Bu barədə sələfilərin ideoloqu olan İbn Teymiyyə deyir:

**ومن حماقتهم إقامه المأتم والنياحه على من قد قتل من سنين عديده**

***"Şiələrin axmaqlıqlarından biri də budur ki, illər öncə öldürülən bir kəsə matəm və əza məclisi təşkil edirlər."[1]***

**وصار الشيطان بسبب قتل الحسين رضي الله عنه يحدث للناس بدعتين، بدعه الحزن والبكاء والنوح يوم عاشوراء... وبدعه السرور والفرح.**

***"Şeytan İmam Hüseynin (ə) öldürülməsi ilə əlaqədar insanlar üçün iki bidət icad etdi:***

***1. Aşura günü hüzn, ağlamaq, ah-nalə etmək bidəti;***

***2. Şadlıq və sevinc bidəti."[2]***

Yenə də İbn Teymiyyənin sözünə oxşar aşağıdakı mətndə gəlmişdir:

**الروافض لما ابتدعوا إقامه المأتم وإظهار الحزن يوم عاشوراء لكون الحسين قتل فيه...**

***"Şiələr İmam Hüseynin (ə) öldürüldüyünə görə Aşura günü matəm saxlamağı bidət qoydular."[3]***

**Cavab:**

Sələfilərin İmam Hüseynin (ə) əzadarlığı barəsində ortaya atdıqları ən əsas şübhələrə aşağıdakı bölmələrdə cavab veriləcək.

**1-ci hissə: Bidətin mənaları və onun əsasları**

**2-ci hissə: Quran və Peyğəmbərlərin (ə) nəzərində ağlamaq və göz yaşı tökməyin icazəli yerləri**

**3-cü hissə: Peyğəmbərin (s) davranışında ağlamaq və göz yaşı tökməyin yerləri**

**4-cü hissə: Peyğəmbər (s) sünnəsində İmam Hüseyn (ə) əzadarlığı**

**5-ci hissə: Məsumların (ə) davranışında İmam Hüseyn (ə) əzadarlığı**

**6-cı hissə: Əzadarlıq barəsində səhabələrin rəftarı**

**7-ci hissə: Əhli-sünnədə əzadarlıq**

---

[1] *İbn Teymiyyə, Minhac əs-sünnə ən-nəbəviyyə, c.1, s.52*

[2] *İbn Teymiyyə, Minhac əs-sünnə ən-nəbəviyyə, c.4, s.334-553*

[3] *İbn Abidin, Haşiyə rədd əl-muxtar, c.2, s.599*

# Müqəddimə

Şəkk yoxdur ki, şadlıq və əzadarlıq məclisləri təşkil etmək fitri bir məsələdir. Belə ki, əvvəldən tayfa və millətlər arasında rəvac tapmışdır və ilahi dinlər də bu prinsipin doğru olduğuna imza atmışlar.

İndi baxın görün, Həzrət İmam Hüseynin (ə) əzadarlığına "bidət" deyənlər nə əsasla bu iddianı edirlər? Bu iddia isbat oluna bilərmi? Yoxsa əksinə, Əhli-Beyt (ə) üçün, xüsusilə azadlıqsevərlər və şəhidlər sərvəri İmam Hüseyn (ə) üçün əzadarlıq etmək zatən bəyənilən və Allaha yaxınlaşdıran ibadətlərin içində daha çox fəzilətə malikdir?

# Bidətin mənaları və onun əsasları

**1. "Bidət"in mənasından alınan səhv nəticə**

İmam Hüseynin (ə) əzadarlığının təşkil olunması ilə bağlı sələfilər tərəfindən olunan mühakimələr barəsində ən yaxşı rəy budur ki, belə deyək:

Sələfilər "bidət" sözünün mənasını düzgün dərk etməyiblər və şəkkə düşüblər. Öz təfəkkürlərinə müxalif olan hər şeyi bidət hesab edir, bunun vasitəsilə digərlərini bidət etməkdə günahlandırırlar.

Buna görə də "bidət" sözünü həm lüğət baxımından, həm də terminoloji baxımdan izah etmək lazımdır. Sonra isə Quran və sünnədə bidətin nə olduğunu araşdırmaq lazımdır.

**2. "Bidət"in lüğət baxımından mənası**

Lüğətçilər əvvəl olmayıb, ondan əsər-əlamət də olmayan, sonra vücuda gələn hər şeyə bidət deyirlər. Əl-Cövhəri yazır:

**البدعه: إنشاء الشيء لا على مثال سابق، واختراعه وابتكاره بعد أن لم يكن.**

> ***"Bidət əvvəl olmayan bir şeyi icad etmək və nümunəsi olmayan bir şeyə təşəbbüs göstərib onu ixtira etməkdir."*[4]**

Qəti şəkildə demək olar ki, ayə və rəvayətlərdə bu mənada bidət haram deyildir. Çünki İslam bəşər həyatında yenilikçiliklə müxalif deyildir, əksinə, bəşər fitrəti ilə müvafiqdir. Belə ki, İslam dini həmişə bəşəri öz fərdi və ictimai həyatında yenilikçilik etməyə sövq edir.

Buna görə də ixtiraçıların öz ixtiralarında etdikləri yeniliklər bu tərifə aid olur, lakin nəinki məzəmmət olunmur, əksinə bəyənilən bir iş hesab olunur.

**3. Şiə və əhli-sünnənin nəzərində "bidət"in terminoloji mənası**

Lakin şəriət nöqteyi-nəzərindən və alimlərin terminologiyasında "bidət"in başqa mənası var. Bu məna onun lüğəti mənası ilə fərqlidir. Çünki "bidət" dinə bir şey nisbət verməyə və ya daxil etməyə deyilir. Belə ki, o dini gətirən belə bir şey icad etməmiş və buna razılığı yoxdur.

"Bidət"in deyilən mənası dinə din adı ilə hər hansı bir şeyi artırıb-azaltmaqdan ibarətdir. Bu, lüğəti məna ilə tam fərqli bir mənadır. Rağib əl-İsfahani deyir:

---

[4] *Əl-Cövhəri, Sihah əl-lüğəh, c.3, s.113*

والبدعه في المذهب: إيراد قول لم يستنَّ قائلها وفاعلها فيه بصاحب الشريعه وأماثلها المتقدّمه وأصولها المتقنه.

***"Dində "bidət" şəriət sahibinə nisbət verilməyən və bunun kimi möhkəm qaydalardan istifadə olunmayan hər danışıq və rəftara deyilir."*[5]**

İbn Həcər əl-Əsqəlani deyir:

والمُحْدَثات بفتح الدال جمع مُحْدَثَه، والمراد بها: ما أحدث وليس له أصل في الشرع ويسمّى في عرف الشرع بدعه، وما كان له أصل يدلّ عليه الشرع فليس ببدعه.

***"Muhdəsət" – Əd-Dal hərfinin fəthəsiylə - muhdəsə (sonradan ortaya çıxarılmış) sözünün cəmidir. Bununla murad edilən, sonradan ortaya çıxarılan və şəriətdə bir əsli (dayanağı) olmayan şeydir. Şərən bu bidət adlanır. Şəriətin dəlalət etdiyi bir əsli (dayanağı) olan şey isə bidət deyildir."*[6]**

Həmin bu tərifi Bədr əd-Din əl-Əyni öz "Səhih əl-Buxari"yə yazdığı şərhində[7], Muhəmməd ibn Əbd ər-Rəhman əl-Mübarəkfuri özünün "Sünən ət-Tirmizi"yə yazdığı şərhində[8], Muhəmməd Şəms əl-Haqq əl-Əziməbadi özünün "Sünən Əbu Davud"a yazdığı şərhində[9] və İbn Rəcəb əl-Hənbəli "Cami əl-ulum"[10] kitabında qeyd etmişlər.

Şiələrin məşhur fəqih və mütəkəllimi olan Seyyid Mürtəza "bidət"in tərifi haqqında yazır:

البدعه زياده في الدين أو نقصان منه، من إسناد إلى الدين.

***"Bidət" dinə nisbət verərək ona bir şey artırıb-azaldılmağa deyilir."*[11]**

Fəxr əd-Din ət-Tureyhi deyir:

البدعه: الحدث في الدين، وما ليس له أصل في كتابٍ ولا سنّه، وإنّما سُمّيَتْ بدعه؛ لأنّ قائلَها ابتدعها هو نفسه

***"Bidət" dində əsası Quran və sünnədə olmayan yeniliyə deyilir. Buna ona görə "bidət" deyilir ki, bidəti edən onu ibda (icad) etmişdir."*[12]**

Buna əsasən, bidətin lüğəti mənası şəri mənasından daha genişdir.

## 4. Bidətin rüknləri

Yuxarıda deyilənləri nəzərə alsaq, bidət iki əsas rüknə bölünür:

**a. Dindən istifadə etmək**

Bidət edən dindən istifadə edərək bir şərtlə dinə bir şey əlavə edir və ya dindən bir şeyi azaldır ki, onu Allaha və Peyğəmbərə (s) nisbət verir. Lakin bəzi yeniliklər insanın yenilikçilik istəyi ilə müvafiq olarsa, bidət hesab olunmur. Məsələn, futbol, basketbol oyunları kimi.

**b. Kitab və sünnədə əsası olmayan şeylər**

Bidətin terminoloji tərifinə nəzər salsaq, o iş bidət hesab olunur ki, onun İslam mənbələrində ya xüsusi formada, ya da ümumi formada dəlili olmasın.

---

[5] *Rağib əl-İsfahani, Müfrədat əlfaz əl-Quran, s.39*
[6] *İbn Həcər əl-Əsqəlani, Fəth əl-Bari, c.13, s.212*
[7] *Bədr əd-Din əl-Əyni, Umdə əl-qari, c.25, s.27*
[8] *Muhəmməd ibn Əbd ər-Rəhman əl-Mübarəkfuri, Tohfə əl-əhvəzi, c.7, s.366*
[9] *Muhəmməd Şəms əl-Haqq əl-Əziməbadi, Ovn əl-məbud, c.12, s.235*
[10] *İbn Rəcəb əl-Hənbəli, Cami əl-ulum və əl-hikəm, s.160, Hind çapı*
[11] *Rəsail şərif Mürtəza, c.2, s.264, "Dar əl-Quran əl-Kərim" nəşriyyatı, Qum*
[12] *Məcmə əl-bəhreyn, c.1, s.163, Maddə: "bidət"*

Lakin kitab və sünnədə ümumi formada istinbat olunmağa qabiliyyəti olan, İslam dinində və digər asimani dinlərdə mövcud olan, bəşər fitrəti ilə münasib olan bəzi işlər bidət sayılmır.

**5. Sələfilərin "bidət"in mənası barəsində azğınlıqlarının kökü**

"Bidət"in lüğəti və terminoloji mənasından və onun rüknlərindən aydın oldu ki, bidəti bir şəxsə və ya bir qrupa nisbət vermək, sələfilərin hər hansı bir yeniliyi bidətə yapışdırmaları kimi sadə bir məsələ deyil. Halbuki, bunun şərtləri və xüsusi səciyyələri var. Bu şərtlər və xüsusiyyətlər aydınlaşmayınca ona "bidət" demək olmaz.

Lakin bəzilərinin səhv etmələrinə və asanlıqla digərlərini bidət etməkdə ittiham etmələrinə səbəb olan Peyğəmbərdən (s) nəql olunmuş hədisdə olan bu ifadədir:

كلّ بدعه ضلاله.

***"Bütün bidətlər azğınlıqdır."***[13]

Lakin bu hədisə əsasən, cəmiyyətdə bütün yeni ortaya çıxan məsələləri bidətin bariz nümunəsi və bu yeniliklərə etiqad bəsləyənləri dindən çıxmış hesab etmək olarmı?

Sualın cavabı mənfidir. Çünki deyildiyi kimi, şəriət sahibinin (Peyğəmbərin (s)) vəzifəsi nümunəni təyin etmək deyil, hökmü bəyan etməkdir. Ola bilər ki, yeni meydana çıxan bir şey hər hansı bir şəxsin və ya hər hansı bir cəmiyyətin nəzərinə əsasən, bidətin nümunəsi sayılsın, lakin başqa bir ideoloji məktəbin nəzərində həmin iş dinin şüarlarından, gözəl sünnələrdən hesab olunsun.

**6. Bidətdən xaric olmanın şəri dəlili**

Əvvəlki mətləblərdən bu aydın oldu:

***Bidət – Allaha və dinə iftira atmaq məsqədilə dinə bir şeyi əlavə etmək və ya artırmaq və onu dinə, Allaha nisbət verməkdir.***

Bidəti müəyyən etməyin meyarı aydınlaşandan sonra şəri dəlili mövcud olan mövzular bidətdən xaric olur. Bu şəri dəlili iki qismə bölmək olar:

1. Qurandan və sünnədən onun yerləri, həddi-hüdudları, xırdalıqları barəsində xüsusi dəlilin olması. Məsələn, Qurban və Ramazan bayramını qeyd etmək, Ərafatda və Minada toplanmaq bidət hesab olunmur. Əksinə, Peyğəmbər (s) bu barədə xüsusi göstəriş verdiyi üçün sünnə və onu yerinə yetirmək ilahi əmrə itaət etmək hesab olunur.

2. Yeni meydana gələn şeyə aid olan Qurandan və sünnədən ümumi dəlilin olması. Lakin bu, bir şərtə bağlıdır ki, o yeni meydana gələn şey Peyğəmbərin (s) risaləti dövründə olan bəzi şeylərlə zahiri forma baxımından fərqli olsa da, mahiyyət baxımından eyni olsun. Lakin bu ümumi dəlil hər iki nümunəyə şamil olur və şəri cəhətdən höccət hesab olunur. Məsələn, Allah-Təala buyurur:

وَ أَعِدُّوا لَهُمْ مَا اسْتَطَعْتُمْ مِنْ قُوَّه وَ مِنْ رِباطِ الْخَيْلِ تُرْهِبُونَ بِهِ عَدُوَّ اللَّهِ وَ عَدُوَّكُم

***"Allahın düşmənini, öz düşməninizi və onlardan qeyri – sizin tanımadığınız və Allahın tanıdığı – digər düşmənləri qorxutmaq üçün onların müqabilində***

[13] *Müslim ən-Nisaburi, əs-Səhih, c.3, s.11; Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.310*

***bacardığınız qədər qüvvə (insan qüvvəsi, müasir silahlar və döyüş xərcləri) və bağlanmış və bəslənmiş atlar (münasib minik vasitələri) tədarük görün."***[14]

Müsəlmanlar üçün vacib işlərdən biri də budur ki, kafirlərin hücumuna qarşı həmişə hazırlıqlı olsunlar. Başqa bir məsələ də budur ki, xətər ehtimalı verilən hər nöqtəni bağlamaq və oranı müdafiə etməyə hazır olmaq lazımdır.

Yuxarıdakı ayədə iki dəlil mövcuddur:

1. **Xüsusi dəlil:** Bu dəlilə əsasən, İslam hökuməti ilahi əmrə tabe olaraq süvari qüvvələr hazırlamalıdır. Bu süvari qüvvələr İslamın əvvəlində olan dövrə aiddir.

2. **Ümumi dəlil:** Bu dəlilə əsasən isə, İslam hökuməti ayənin hökmünə əməl etmək üçün, lakin Peyğəmbərin (s) dövründə olmayan silahlar, hava, quru, dəniz qüvvələri hazırlamalı, onlara lazım olan bütün silahlarla, texnika ilə onları təchiz etməlidir.

Belə işlərə xüsusi şəri dəlil olmadığına görə onlara göz yummaq olmaz. Başqa sözlə desək, aşağıdakı ayəni misal çəkmək olar.

وَ إِذا قُرِئَ الْقُرْآنُ فَاسْتَمِعُوا لَهُ وَ أَنْصِتُوا لَعَلَّكُمْ تُرْحَمُونَ.

***"Quran oxunan zaman ona qulaq asın və susun ki, bəlkə rəhm olundunuz."***[15]

Bu ayə müsəlmanları Quran oxunan zaman ona qulaq asmağa çağırır. Lakin bu ayənin mövcud nümunəsi Peyğəmbərin (s) zamanında Peyğəmbər (s) məscidində və ya evdə birbaşa Quran tilavət edəndən eşitməkdən ibarətdir. Lakin indiki əsrdə, texnologiyanın inkişaf etdiyi bir dövrdə Peyğəmbərin (s) zamanında olmayan başqa nümunələri də vardır. Məsələn, Quranı televiziyadan, radiodan və başqa vasitələrdən dinləmək bu nümunələrdən hesab olunur. Deməli, bu ayə hər iki yerdə şəri höccət hesab olunur. Biz Qurana bu vasitələrdən qulaq asmağı bidət bəhanəsi ilə və şəri höccətin olmaması ilə tərk edə bilmərik. Nə olsun ki, bu vasitələr Peyğəmbərin (s) zamanında olmamışdır?

Bu barədə minlərlə misal göstərmək olar, lakin biz daha artıq misal çəkmək niyyətində deyilik.

Deməli, ümumi dəlilin mövcudluğu bütün zamanlarda və bütün insanlar üçün şəri höccət hesab olunur. Buna əsasən, belə yerlərdə düşmənçilik və təəssüblə dolu bir nəzərə yox, mötəbər olan şəri dəlilə əsaslanan nəzərə etimad etmək lazımdır. Çünki ictimai yeniliklərin ortaya çıxması inkişafın səbəbi, cəmiyyətin kamilliyi, insanların Allah və Onun dini ilə daha çox tanışlığı, fəsadların qarşısını almaq amili olmaqla yanaşı, həm də Peyğəmbərin (s) razı qaldığı gözəl sünnələrdəndir.

### 7. Bütün əşyalar barəsində olan əsas prinsip onun mübah olmasıdır

Bidət mövzusunda ona diqqət ayırmalı olan məsələlərdən biri də mübahlıq prinsipidir. Yəni, Peyğəmbərin (s) onun barəsində qadağası olmayana qədər hər bir şey mübah hökmü daşıyır və onu yerinə yetirmək caizdir.

Bu şəriət qanunu şəriətin bütün hökmlərində hakimdir. Qurani-Kərim Peyğəmbərin (s) vəzifəsini sadalayaraq buyurur ki, Peyğəmbərin (s) vəzifəsi halal olan əməlləri yox, haram olan əməlləri bəyan etməkdir. Burdan da aydın olur ki, bütün əşyalarda və əməllərdə əsas prinsip onların halal olmasıdır. Lakin Peyğəmbər (s) tərəfindən bunların hər hansı birinin

---

[14] *Əl-Ənfal, 60*

[15] *Əl-Əraf, 204*

qadağan olması istisnadır. Alimlərin vəzifəsi budur ki, bütün gücləri ilə şəriətin xüsusi dəlillərindən istinbat etsinlər. Əgər bu barədə haramlıq hökmü tapmasalar, onun caiz olmasına fətva versinlər. Mübahlıq prinsipi barəsində olan nümunələrdən biri də bu ayədir:

وَ ما لَكُمْ أَلاَّ تَأْكُلُوا مِمَّا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ وَ قَدْ فَصَّلَ لَكُمْ ما حَرَّمَ عَلَيْكُمْ إِلاَّ مَا اضْطُرِرْتُمْ إِلَيْهِ وَ إِنَّ كَثيراً لَيُضِلُّونَ بِأَهْوائِهِمْ بِغَيْرِ عِلْمٍ إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِالْمُعْتَدين

*"Sizə nə olmuşdur ki, (kəsilərkən başı) üzərində Allahın adı çəkilən şeylərdən yemirsiniz, halbuki, O, sizə haram etdiklərini – zərurət halında (yeməyə) məcbur olduğunuz şey istisna olmaqla – bütün təfsilatı ilə bəyan etmişdir?! Şübhəsiz, (insanların) çoxu nadanlıq üzündən öz nəfsi istəkləri ilə (başqalarını) azdırırlar (deyirlər: "Bu necə olur ki, sizin öldürdükləriniz halal, Allahın öldürdüyü isə haramdır?!) Həqiqətən, sənin Rəbbin həddi aşanları (haqdan kənara çıxanların halını) daha yaxşı biləndir."*[16]

Bu ayə bildirmək istəyir ki, bəyan olunmağa ehtiyacı olan məsələlər mübah olanlar deyil, haram olan məsələlərdir. Buna görə də insan şəkk etdiyi məsələlər barəsində onların adını haram olan məsələlərin cədvəlində tapmayana qədər ondan çəkinməsi lazım deyildir.

---

[16] *Əl-Ənam, 119*

# Quran və Peyğəmbərlərin (ə) nəzərində ağlamaq və göz yaşı tökməyin icazəli yerləri

**1. Quran ağlamağı dəstəkləyir**

Bidətin mənalarında olan məsələləri nəzərə alsaq, ağlamaq barəsində Quranda ağlamağın mədh və ya məzəmmət olunmasını müəyyən etmək üçün Quranda olan nöqtələrə işarə edirik.

Ağlayan gözlərə işarə edən ayələr:

فَلْيَضْحَكُوا قَلِيلا وَلْيَبْكُوا كَثِيراً جَزَاءً بِمَا كَانُوا يَكْسِبُونَ

***"Buna görə də gərək (küfr və itaətsizlikdən) əldə etdiklərinin cəzası olaraq (həyatları boyu) az gülsünlər və çox ağlasınlar [Və ya: Buna görə də gərək (küfr və itaətsizliklə) əldə etdiklərinin cəzası olaraq (həyatları boyu) dünyada azacıq gülsünlər və axirətdə çox ağlasınlar]."***[17]

Allah-Təala yuxarıdakı ayədə elə bir işə əmr edir ki, əgər Özü o işə razı olmasaydı, ona əmr etməzdi. Allah-Təala Öz peyğəmbərlərini belə mədh edir:

إِذَا تُتْلَى عَلَيْهِمْ آيَاتُ الرَّحْمَنِ خَرُّوا سُجَّداً وَبُكِيّاً

***"Rəhman olan Allahın ayələri (səma kitablarının ayələri və ya Onun tovhid və əzəmət nişanələri) onlara oxunan zaman ağlar və səcdə edən halda üzü üstə düşərdilər."***[18]

Allah-Təala elm verdiyi kəslərin sifətlərini belə bəyan edir:

وَيَخِرُّونَ لِلْأَذْقَانِ يَبْكُونَ وَيَزِيدُهُمْ خُشُوعاً

***"Və (Allahın hüzurunda) ağlayaraq üzü üstə düşürlər və (Quranı eşitmək və başa düşmək) onlarda (qəlblərində olan Allah) xofu və itaətkarlığı artırır."***[19]

Allah-Təala Quran nazil olan zaman möminləri belə vəsf edir:

وَإِذَا سَمِعُواْ مَا أُنزِلَ إِلَى الرَّسُولِ تَرَى أَعْيُنَهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ

***"Onlar Peyğəmbərə nazil olanı eşidən zaman haqqı tanıdıqları üçün gözlərindən yaş axdığını görərsən."***[20]

Deyildiyi kimi, Qurani-Kərimdə ağlamaq, göz yaşı tökmək müsbət istiqamətdə ruhi dəyişikliyin nəticəsi olaraq məzəmmət olunmamış, əksinə, Allah tərəfindən tərifə layiq bir əməl hesab olunmuşdur. Çünki ağlamaq bəşərin fitri meyllərindən və insan şəxsiyyətinin bir hissəsindən hesab olunur.

**2. Peyğəmbərlərin sirəsində[21] ağlamaq**

İmam Hüseynə (a) ağlamaq mövzusunda böyük ilahi peyğəmbərlərin əməli sirəsinə iqtida etmək, bunun əql və nəql baxımından məşru olmasını bilmək mühüm ünsürlərdəndir.

---

*17 Ət-Tövbə, 82*
*18 Məryəm, 58*
*19 Əl-İsra, 109*
*20 Əl-Maidə, 83*
*21 Sirə - yəni, əməl, rəftar, adət-ənənə, həyat tərzi*

Çünki peyğəmbərlərin əməli sirəsi bizim əməllərimizin din baxımından məşru olmasına ən yaxşı şahiddir. Necə ki, Allah-Təala onların üslubuna tabe olmağı bizə əmr edir:

قَدْ كَانَتْ لَكُمْ أُسْوَةٌ حَسَنَةٌ فِي إِبْرَهِيمَ.

***"Şübhəsiz, İbrahim(in) və onunla birlikdə olanlar(ın rəftarın)da sizin üçün gözəl bir örnək vardır."[22]***

لَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللَّهِ أُسْوَةٌ حَسَنَةٌ لِّمَن كَانَ يَرْجُو اللَّهَ وَالْيَوْمَ الْآخِرَ وَذَكَرَ اللَّهَ كَثِيرً

***"Şübhəsiz, Allaha və axirət gününə (qəlbdə və əməldə) ümid bəsləyən və Allahı çox zikr edənlər üçün Allah Rəsulunun rəftarında həyat örnəyi və nümunəsi vardır."[23]***

Müxtəlif hadisələrlə üzləşən zaman peyğəmbərlərin ruhi təəssüratları ilə bağlı yaşayışlarından müəyyən hissələri nəql etməklə bizə qaneedici cavaba yetişməkdə kömək edə bilir. İndi onlardan bəzilərinə işarə edirik:

**a) Övladının ayrılığına Yəqub peyğəmbərin (ə) ağlaması**

Həzrət Yusifin (ə) macərası əvvəldən sonadək qorxunc və təsiredici bir faciə kimi nəql olunub. Həsəd atəşi Həzrət Yusifin (a) qardaşlarının ürəyində coşub-daşırdı və bu həsəd qardaşları Həzrəti (ə) yox etmək qərarına gətirir. Belə ki, Həzrəti (ə) quyunun dibinə atır, onun köynəyini parça-parça edərək qana bulayırlar. Atalarına da qardaşlarını canavarın yediyini xəbər verirlər. Bu xəbərdən sonra Həzrət Yəqub (ə) sonsuz qəm-qüssə keçirərək övladının əlindən çıxması ilə əlaqədar gecə-gündüz ağlayırdı. Allah-Təala bu macəranı Həzrət Yəqubun (ə) dilindən belə buyurur:

وَقَالَ يَأَسَفَي عَلَي يُوسُفَ وَابْيَضَّتْ عَيْنَاهُ مِنَ الْحُزْنِ فَهُوَ كَظِيمٌ

***"Dedi: "Heyif Yusufdan!" Və qəm-qüssədən (qəm-qüssənin çoxluğundan) onun hər iki gözünə ağ gəldi və onu daim qüssə boğurdu."[24]***

Həzrət Yəqub (ə) övladının diri olduğunu və yenidən onu ağuşuna alacağını bilə-bilə bu ayrılığa ağlayır. Həzrət (ə) bu ruhi çətinliyinə təskinlik tapmaq üçün pənahgah axtarır və buyurur:

قَالَ إِنَّمَآ أَشْكُواْ بَثِّي وَحُزْنِي إِلَي اللَّهِ وَأَعْلَمُ مِنَ اللَّهِ مَا لَاتَعْلَمُونَ

***"Dedi: "Mən öz ağır kədər və qüssəmdən (sizə deyil) yalnız Allaha şikayət edirəm və Allah tərəfindən sizin bilmədiyiniz bir şey (Yusufun diri olmasını) bilirəm."[25]***

Görəsən, bu iki ilahi peyğəmbərin (ə) təsirli cümlələrlə yaşayış macərasının həsəd aparanların daxili duyğularını oyatmaqdan başqa bir məqsədi varmı?

Bu ilahi dəlildən övliyalara ağlamağın və zalımlardan, onların pis əməllərindən Allaha şikayət etməyin caiz olması nəticəsi alınır. Bu da ilahi peyğəmbərlərdən birinin sirəsi kimi müsibətlərə əzadarlıq etməyin məşru olmasına qəti bir dəlildir.

Digər tərəfdən də təfsir kitablarında çoxsaylı hədislərdən biri Həzrət Yəqubun (ə) qəm-qüssəsinin bir hissəsini şərh etməsi alimlərin peyğəmbərlər və övliyaların bu acınacaqlı

---

[22] *Əl-Mumtəhinə, 4*
[23] *Əl-Əhzab, 21*
[24] *Yusif, 84*
[25] *Yusif, 86*

yaşayışlarının sərgüzəştlərindən istifadə etmələrinə başqa bir dəlildir. Nümunə olaraq əhli-sünnə mənbələrindən bir neçə rəvayətə işarə edirik:

Əbu əl-Qasim əz-Zəməxşəri bu ayənin təfsirində özünün "əl-Kəşşaf" kitabında yazır:

**ما جفت عيناه من وقت فراق يوسف إلى حين لقائه ثمانين عاما، وما على وجه الأرض أكرم على الله منه.**

***"Həzrət Yəqubun (ə) Həzrət Yusifin (ə) ayrılığından onunla görüşənədək ağlamaqdan gözlərinin yaşı qurudu. Bu müddət 80 il davam etdi. Allah yanında yer üzündə bu işdən dəyərli bir iş yox idi."***[26]

Bu təfsirdə Peyğəmbərdən (s) belə bir rəvayət də nəql olunmuşdur:

**أنه سئل جبرئيل عليه السلام: ما بلغ من وجد يعقوب على يوسف؟ قال: وجد سبعين ثكلى. قال: فما كان له من الأجر؟ قال: أجر مائه شهيد، وما ساء ظنه بالله ساعه قط.**

***Peyğəmbər (s) Cəbrayıldan (ə) soruşdu: "Yusifin (ə) ayrılığı səbəbinə Yəqubun (ə) başına nələr gəldi?" Cəbrayıl (ə) ərz etdi: "70 qadının balasının yasında oturmasının savabı qədər onun başına iş gəldi." Həzrət (s) soruşdu: "Həzrət Yəqubun (ə) bu səbrinə görə mükafatı nə qədərdir?" Cəbrayıl (ə) ərz etdi: "Yüz şəhidin savabı qədər. Bu, belə bir halda idi ki, Həzrət Yəqub (ə) heç vaxt Allaha qarşı sui-zənn etmədi."***[27]

Əs-Süyuti İbn Cərirdən, o da İkrimədən nəqlən belə yazır:

**أتي جبرئيل عليه السلام يوسف عليه السلام وهو في السجن، فسلّم عليه، فقال له يوسف: أيّها الملك الكريم علي ربّه، الطيّب ريحه، الطاهر ثيابه، هل لك علمٌ بيعقوب؟ قال: نعم، ما أشدّ حزنه؟ قال: ما ذا له من الأجر؟ قال: أجر سبعين ثكلي، قال: أفتراني لاقيه؟ قال: نعم، فطابت نفس يوسف.**

***"Cəbrayıl (ə) Həzrət Yusif (ə) zindanda olarkən onun yanına gəlib salam verdi. Yusif (ə) ondan soruşdu: "Ey Allahın yanında hörmətli olan mələk, iyin gözəl, paltarın da təmizdir, Yəqubdan (ə) xəbər gətirmisən?" Cəbrayıl (ə) ərz etdi: "Bəli, o, çox ağır qəm-qüssəyə qərq olub." Yusif (ə) soruşdu: "Bunun mükafatı nə qədərdir?" Cəbrayıl (ə) ərz etdi: "70 qadının balasının yasında oturmasının savabı qədər onun savabı vardır." Həzrət (ə) soruşdu: "Mən onunla görüşə biləcəyəm?" Cəbrayıl (ə) ərz etdi: "Bəli". Yusif (ə) bu sözü eşitməklə aram oldu."***[28]

Əs-Süyuti belə yazır:

**بكي يعقوب علي يوسف ثمانين عاماً، حتّي ابيضّت عينا من الحزن...**

***"Yəqub (ə) Yusif (ə) üçün qəm-qüssədən gözləri ağaranadək 80 il ağladı."***[29]

**b) Yusifin (ə) ağlaması**

Nəinki Həzrət Yəqub (ə) bu ayrılığa göz yaşı tökürdü, Həzrət Yusif (ə) də bu ayrılığa yanırdı. İbn Abbasın belə dediyi nəql olunur:

**عند ما دخل السجن، يبكي حتّي تبكي معه جدر البيوت وسقفها والأبواب.**

***"Həzrət Yusif (ə) zindana düşəndə elə ağlayırdı ki, zindanın qapıları, divarları, hətta tavanı belə onunla birgə ağlayırdı."***[30]

---

[26] *Əz-Zəməxşəri, Əl-Kəşşaf, c.2, s.339*

[27] *Əz-Zəməxşəri, Əl-Kəşşaf, c.2, s.339*

[28] *Cəlal əd-Din əs-Süyuti, əd-Durr əl-mənsur, c.4, s.31*

[29] *Cəlal əd-Din əs-Süyuti, Əd-Durr əl-mənsur, c.4, s.31; İbn Cərir ət-Təbəri, Cəmi əl-bəyan an təvil əl-Quran, c.1, s.250*

İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə isə belə deyilir:

**البكّائون خمسه، آدم، و يعقوب و... و أمّا يوسف فبكي علي يعقوب حتّي تأذّي به أهل السجن، وقالوا: إمّا أن تبكي نهاراً وتسكت الليل، وإمّا أن تبكي الليل وتسكت النهار، فصالحهم علي واحد منهما.**

***"Çox ağlayanlar beş nəfər olublar. Adəm (ə) behiştdən uzaq düşdüyünə görə daim ağlayırdı. Həzrət Yəqub (ə) və ... , və Həzrət Yusif (ə) atasından ayrılıq səbəbinə və atasının mehribanlıqla dolu olan ağuşundan fərağı səbəbinə o qədər ağlayırdı ki, zindanda yatan digər şəxslər bu ağlamaqdan əziyyət çəkərək ona belə bir iş təklif etdilər: "Ya gündüzlər ağla, gecələr sakit qal, ya da gecələr ağla, gündüzlər sakit qal." Həzrət (ə) məcbur qalıb onların bu təklifini qəbul etdi."[31]***

**<u>c) Allah Rəsulunun (s) sünnəsində ağlamaq və göz yaşı tökmək</u>**

**I. Yaşlı gözlərə sahib olmağı arzulamaq**

Əl-Qurtubinin təfsirində Allahla münacatı zamanı Həzrət Peyğəmbərin (s) Allahdan belə bir istəyinə işarə olunub:

**اللّهمّ اجعلني من الباكين إليك، والخاشعين لك.**

***"Ya Allah! Məni Sənin üçün ağlayanlardan və xuşu edənlərdən qərar ver!"[32]***

O Həzrətdən (s) nəql olunan başqa bir duada deyilir:

**اللّهمّ ارزقني عينين هطالتين.**

***"Ya Allah! Mənə ağlayan gözlər inayət elə!"[33]***

Həqiqətdə Allah Rəsulu (s) dua və münacatlarının arasında Allahın razı olduğu batini arzusunu Allahdan istəmişdir. Əgər bu iş Allah tərəfindən dəstəklənməsəydi, heç vaxt Həzrət (s) öz münacatında belə bir arzunu Allahdan istəməzdi.

**II. Atəşin heç vaxt yandırmayacağı gözlər**

Peyğəmbərdən (s) iki qrupun mədhi haqqında belə bir hədis nəql olunur:

**عينان لا تمسّهما النار؛ عين بكت من خشيه اللّه، وعين باتت تحرس في سبيل اللّه.**

***"İki göz cəhənnəm atəşindən amandadır: Allah qorxusundan ağlayan göz və camaatın canını, namusunu və əmin-amanlığını qorumaq üçün gecələr yatmayan göz."[34]***

**III. Allaha görə ağlamaq**

Əl-Buxari öz «əs-Səhih»ində Həzrət Peyğəmbərdən (s) belə bir hədis nəql edir:

**سبعه يظلّهم اللّه... رجل ذكر اللّه ففاضت عيناه.**

***"Yeddi qrupu Allah Öz rəhmətinin kölgəsində qərarlaşdıracaq ... Yanında Allah xatırlananda gözlərindən yaş gələn kəsləri."[35]***

**IV.Allah qorxusundan ağlamaq**

---

[30] *Əbu Abdullah əl-Qurtubi, əl-Cami li-Əhkam əl-Quran, c.9, s.88*

[31] *İbn Əbi əl-Fəth əl-İrbili, Kəşf əl-ğummə, c.2, s.120; Şeyx əs-Səduq, əl-Xisal, s.272; Şeyx əs-Səduq, əl-Əmali, s.204; Əl-Fəttal ən-Nisaburi, Rövzə əl-vaizin, s.451; İbn Şəhr Aşub, əl-Mənaqib, c.3, s.104*

[32] *Əbu Abdullah əl-Qurtubi, əl-Cami li-Əhkam əl-Quran, c.11, s.215*

[33] *Muhəmməd əl-Munəvi, Feyz əl-qədir, c.2, s.181*

[34] *Əbu İsa ət-Tirmizi, əs-Sunən, c.3, s.96*

[35] *Muhəmməd ibn İsmayıl əl-Buxari, əs-Səhih c.7, s.185*

Ət-Tirmizi öz "əs-Sünən"ində belə nəql edir:

عن رسول خدا صلي الله عليه وآله وسلّم: لا يلج النار رجل بكي من خشيه اللّه.

*Peyğəmbərin (s) belə buyurduğu nəql olunur: "Allah qorxusundan ağlayan kəs cəhənnəmə daxil olmayacaq."*[36]

**V. Dünyada ağlamaq axirətdə ağlamağın qarşısını alır**

Hafiz əl-İsfahani öz kitabında Peyğəmbərdən (s) belə bir hədis nəql edir:

من بكي علي ذنبه في الدنيا حرّم اللّه ديباجه وجهه علي جهنّم.

*"Dünyada günahlarına görə ağlayan kəsin üzünə Allah cəhənnəmi haram edər."*[37]

[36] *Əbu İsa ət-Tirmizi, əs-Sünən, c.3, s.380*

[37] *Hafiz əl-İsfahani, Zikru əxbari İsfahan, c.2, s.171*

# Peyğəmbərin (s) sirəsində ağlamağın yerləri

## <u>1. Həzrət Həmzənin (r) şəhadətində Həzrət Peyğəmbərin (s) ağlaması</u>

Əbd əl-Müttəlibin oğlu Həmzə İslamın qəhrəman və seçilmiş simalarından idi. O, Uhud döyüşündə şəhadətə çatdı. Allah Rəsulu (s) əmisinin şəhadətə çatmasına çox qəmgin oldu. Həzrət (s) əmisi Həmzəni "Seyyidüş-şühəda" (şəhidlər sərvəri) adlandırdı və onun ayrılığına ağladı.

Uhud döyüşündə Həzrət Peyğəmbərin (s) əmisi Həmzənin şəhadət xəbəri Həzrətin (s) qəlbində dərin bir təsir qoydu. Çünki Həzrət (s) tövhid məktəbinin ən böyük müdafiəçilərindən və özünün düzgün himayəçilərindən birini əldən vermişdi.

Buna görə də bu dərdli hadisənin müqabilində haqq olan Allahın elçisinin (s) reaksiyası onun tabeçiləri üçün əbədi nümunədir.

Nur əd-Din əl-Hələbi əş-Şafei öz "əs-Sirə" kitabında yazır:

**لما رأى حمزة قتيلا بكى ، فلما رأى ما مُثِّل به شهق**

***"Peyğəmbər (s) Həmzənin qanlı cəsədini görüb ağladı, lakin onun müslə olunmasından (bədən əzalarının kəsilməsindən, ciyərinin çıxarılmasından – Müt.) xəbərdar olduqdan sonra isə fəryad edərək ağlamağa başladı."[38]***

Həzrətin (s) əmisi Həmzənin əzasında ağlaması o qədər şiddətli idi ki, İbn Məsud bu barədə deyir:

**ما رأينا رسول اللّه صلّي الله عليه و آله وسلّم باكياً أشدّ من بكائه علي حمزه، وضعه في القبله، ثمّ وقف علي جنازته، وانتحب حتّي بلغ به الغشي، يقول: يا عمّ رسول اللّه! يا حمزه! يا أسد اللّه! وأسد رسوله! يا حمزه! يا فاعل الخيرات! يا حمزه! يا كاشف الكربات! يا حمزه! يا ذابّ عن وجه رسول اللّه!.**

***"Biz Allah Rəsulunun (s) əmisi Həmzəyə ağladığı kimi kimsəyə ağladığını görməmişdik. Həzrət (s) onu qibləyə tərəf qoydu. Sonra cənazənin yanında dayandı, o qədər uca səslə ağladı ki, qəşş etmək halına yetişdi. Sonra cənazəyə xitabən buyurdu: "Ey Allah Rəsulunun (s) əmisi! Ey Həmzə! Ey Allahın şiri! Ey Allah Rəsulunun (s) şiri! Ey Həmzə! Ey yaxşı işlər görən! Ey Həmzə! Ey çətinlikləri həll edən! Ey Həmzə! Ey Allah Rəsulunun (s) çətinliklərini uzaqlaşdıran!"[39]***

Lakin Həzrət Peyğəmbərin (s) ağlamaq macərası Həzrətin (s) Uhud döyüşündən qayıdan zaman Mədinə camaatının evlərindən şəhidlər üçün qalxan ağlamaq səsləri ilə başladı:

**ومر رسول الله صلى الله عليه وسلم بدار من دور الأنصار من بنى عبد الأشهل وبنى ظفر فسمع البكاء والنوائح على قتلاهم فذرفت عينا رسول الله صلى الله عليه وسلم فبكى ثم قال لكن حمزه لا بواكي له فلما رجع سعد بن معاذ وأسيد بن حضير إلى دار بنى عبد الأشهل أمرا نساءهم أن يتحزمن ثم يذهبن فيبكين على عم رسول الله صلى الله عليه وسلم**

***"Həzrət Peyğəmbər (s) Mədinə camaatının (Bəni Əbd Əl-Əşhəl və Bəni Zəfər qəbilələrinin) evlərinin yanından keçərkən onların öz şəhidləri üçün ağlamaq və***

---

[38] *Əs-sirə əl-Hələbiyyə, c.2, s.247*

[39] *Muhib əd-Din ət-Təbəri, Zəxair əl-uqba, s.181*

***növhə səslərini eşitdi. Həzrətin (s) gözləri doldu və ağladı. Sonra isə buyurdu: "Lakin əmim Həmzənin ağlayanı yoxdur." Səd ibn Məaz və Useyd ibn Həzir Bəni Əbd əl-Əşhəl qəbiləsinin evlərinə qayıdarkən onların qadınlarına göstəriş verdilər ki, öz qəm-qüssələrini sinələrində dondurub əvvəlcə Həzrət Peyğəmbərin (s) əmisi Həmzə üçün ağlayıb əzadarlıq etsinlər."***[40]

Bundan sonra Peyğəmbərin (s) bu göstərişini eşidən hər kəs hər hansı bir şəhidə ağlamamışdan əvvəl birinci Həmzəyə ağlayardılar:

**فلم تبك امرأه من الأنصار علي ميّت بعد قول رسول اللّه صلّي الله عليه و آله وسلّم لكنّ حمزه لابواكي له إلي اليوم إلّا بدأت البكاء علي حمزه.**

***"Peyğəmbərin (s) "Əmim Həmzənin ağlayanı yoxdur!" kəlamını eşidəndən sonra heç bir qadın öz ölüsünə Həmzə üçün ağlamazdan əvvəl ağlamadı."***[41]

İbn Kəsir deyir: "Bu günə qədər də Ənsar qadınları öz ölənlərinə ağlamazdan əvvəl, birinci Həmzəyə ağlayırlar."

**أحمد بن حنبل عن ابن عمر أن رسول الله صلى الله عليه وسلم لما رجع من أُحد ، فجعلت نساء الأنصار يبكين على من قتل من أزواجهن ، قال : فقال رسول الله صلى الله عليه وسلم : ولكن حمزه لا بواكي له ، قال : ثم نام فاستنبه وهن يبكين. قال فهن اليوم إذا يبكين يندبن بحمزه.**

***Əhməd ibn Hənbəl İbn Ömərdən nəql edir ki, Allahın Rəsulu (s) Uhuddan qayıdan zaman Ənsarın qadınlarının öz şəhidləri üçün ağladığını müşahidə etdi. İbn Ömər deyir ki, Allahın Rəsulu (s) buyurdu: "Lakin Həmzənin ağlayanı yoxdur." Həzrət (s) bir az yatıb istirahət edəndən sonra qadınlar Həmzə üçün ağlamağa başladılar.***

**قال فهن اليوم إذا يبكين يندبن بحمزه.**

***İbn Ömər deyir ki: "O gündən bu günədək qadınlar əvvəlcə Həmzəyə, sonra isə öz ölənlərinə əzadarlıq edirlər."***[42]

İbn Kəsir bunu deyəndən sonra belə bir nəzər irəli sürür:

**وهذا على شرط مسلم.**

***"Bu rəvayət Müslimin şərtinə görə səhihdir."***[43]

Əl-Vaqidi də bu məsələnin davam etdiyini, qadınların əvvəlcə Həmzəyə, sonra isə öz ölənlərinə ağladığını deyir:

**قال الواقدي فلم يزلن يبدأن بالندب لحمزه حتى الآن.**

***Əl-Vaqidi deyir: "O zamandan indiyədək qadınlar birinci Həmzəyə əzadarlıq edirlər."***[44]

İbn Səd də həmin məsələlərə işarə edərək deyir:

**فهن إلى اليوم إذا مات الميت من الأنصار بدأ النساء فبكين على حمزه ثم بكين على ميتهن.**

---

[40] *İbn Cərir ət-Təbəri, ət-Tarix, c.2, s.210; İbn Hişam, Əs-Sirə ən-Nəbəviyyə, c.3, s.613; İbn Hibban, Əs-Siqat, c.1, s.234; İbn Kəsir, əl-Bidayə və ən-Nihayə, c.4, s.54-55*

[41] *İbn Həcər əl-Heysəmi, Məcmə əz-Zəvaid, c.6, s.126*

[42] *İbn Kəsir, əl-Bidayə və ən-Nihayə, c.4, s.55*

[43] *İbn Kəsir, əl-Bidayə və ən-Nihayə, c.4, s.55*

[44] *İbn əl-Əsir, Usd əl-Ğabə, c.2, s.48*

*"O gündən Ənsarın qadınları birinci Həmzəyə, sonra isə öz ölənlərinə ağlayırlar."*[45]

Görəsən, Allah Rəsulunun (s) bu əməli ağlamağın, əzadarlıq etməyin məşruiyyətinə (şəriətə müvafiq olmasına) dəlalət etmirmi?

Möminlər və Həzrət Peyğəmbərin (s) düzgün davamçıları Həzrətin (s) əməli sünnəsini öz əməllərinin meyarı hesab edir. Buna görə də Həzrət Peyğəmbərin (s) əmisi Həmzənin şəhadətində təşkil etdiyi əzadarlıq övliyaların, din rəhbərlərinin şəhadəti münasibətilə keçirilən əzadarlıqlara şəri bir meyardır.

**2. Cəfər ibn Əbi Talibin (Cəfər Təyyar) (r) şəhadətində Həzrət Peyğəmbərin (s) ağlaması**

Cəfər ibn Əbi Talib Təyyar (r) Mutə döyüşünün komandirlərindən idi. Allahın Rəsulu (s) Cəfərin şəhadət xəbərini eşidən kimi onun övladlarının yanına getdi. Evə daxil olan kimi Cəfərin uşaqlarını səslədi. Mübarək gözlərindən yaş axa-axa o uşaqları iylədi. Cəfərin həyat yoldaşı nəyinsə baş verdiyini hiss etdiyi üçün Həzrətdən (s) soruşdu:

بأبي وأمّي ما يبكيك؟ أبلغك عن جعفر وأصحابه شيء؟

*"Atam-anam sənə fəda olsun, sizi ağladan nədir? Cəfər və onun yoldaşlarından sizə bir xəbərmi yetişib?"*

قال: نعم، أصيبوا هذا اليوم.

*Buyurdu: "Bəli, onlar bu gün şəhid oldular."*

*Əsmanın fəryadı ucaldı. Qadınlar ətrafına toplaşdılar. Həzrət Fatimeyi-Zəhra (s.ə) evə daxil oldu. Ağlayaraq belə fəryad elədi: "Va Əmmah! (Əmim, vay!)"*

فقال رسول اللّه صلّي الله عليه و آله وسلّم: علي مثل جعفر فلتبك البواكي.

*Allahın Rəsulu (s) buyurdu: "Ağlayanlar gərək Cəfər kimilərinə ağlasınlar."*[46]

Həzrət Peyğəmbərin əməli üsulu və sünnəsi (s) ölənlərə ağlamağı və əzadarlıq mərasimlərini təsdiq etməsindən əlavə qeyd olunmuş bu nümunələr Həzrətin (s) təqrir və imzası hesab olunur. Çünki ağlayıb əzadarlıq edən müsibət sahiblərinə Həzrət (s) bu işi qadağan etmədi. Əksinə, bu qadağanı qoymamaqdan əlavə Həzrətin (s) özü əzadarlıq edib ağlayır.

**3. Zeyd ibn Harisənin şəhadətində Həzrət Peyğəmbərin (s) ağlaması**

Zeyd ibn Harisə də Mutə döyüşünün komandirlərindən idi. Belə ki, o, Allah Rəsulunun (s) göstərişi ilə Cəfər ibn Əbi Talib və Abdullah ibn Rəvahə ilə birlikdə müharibənin rəhbərliyini öz öhdəsinə götürmüşdü. Onun şəhadət xəbəri bildirilən kimi Allah Rəsulu (s) onun evinə getdi. Zeydin qızı Həzrəti (s) görən kimi boğazını qəhər tutdu və uca səslə ağlamağa başladı. Həzrət (s) də ağladı. Soruşdular ki, "niyə ağlayırsınız?" Həzrət (s) buyurdu:

شوق الحبيب إلي حبيبه.

*"Dostun dosta olan məhəbbətindən (ağlayıram)."*[47]

---

[45] *İbn Səd, ət-Təbəqat əl-kubra, c.2, s.44*

[46] *İbn Əbd əl-Birr, əl-İstiab, c.1, s.313; İbn əl-Əsir, Usd əl-ğabə, c.1, s.241; İbn Həcər əl-Əsqəlani, əl-İsabə, c.2, s.238; İbn əl-Əsir, əl-Kamil fi ət-tarix, c.2, s.420*

**4. Həzrət Peyğəmbərin (s) öz oğlu İbrahimin vəfatında ağlaması**

İbrahim Mədinədə Peyğəmbərə (s) nəsib olunan yeganə oğlan idi. Lakin bir yaşında vəfat elədi və atasını öz ayrılıq qəminə oturtdu.

İbrahim Mariyə adlı anadan dünyaya gəlmişdi. Ömründən 18 ay keçməmişdi ki, qəzavü-qədər onu atasından aldı və Həzrət (s) kiçik yaşlı övladı üçün ağladı. Əbd ər-Rəhman ibn Ovf Həzrətin (s) ağlamağına təəccüblənib soruşdu:

**وأنت يا رسول اللّه؟**

***"Ya Rasuləllah (s), sən də ağlayırsan?"***

Həzrət (s) buyurdu:

**يا ابن عوف، إنّها رحمه**

***"Ey Ovfun oğlu, övladının ölümündə göz yaşı tökmək Allahın lütf və mərhəmətidir."***

Sonra buyurdu:

**إنّ العين تدمع، والقلب يحزن، ولانقول إلّا ما يرضي ربّنا، وإنّا بفراقك يا إبراهيم لمحزونون.**

***"Göz ağlayır, qəlb qəmgin olur. Lakin Allahı razı salan sözdən başqa heç bir söz deməri̇k. Ey İbrahim, biz sənin ayrılığına qəmginik!"[48]***

**5. Peyğəmbərin (s) Əbd əl-Müttəlib üçün ağlaması**

Həzrət Əbd əl-Müttəlib dünyasını dəyişəndən sonra Allah Rəsulu (s) əziz babası üçün ağladı. Ümmü Əymən deyir:

**انا رايت رسول اللّه يمشى تحت سريره و هو يبكى**

***"Mən Allah Rəsulunu (s) Əbd əl-Müttəlibin yatağının aşağı tərəfinə gedərək ağladığını gördüm."[49]***

**6. Peyğəmbərin (s) Əbu Talib üçün ağlaması**

Peyğəmbərin (s) əziz himayəçisi və imanlı əmisi Əbu Talibin dünyasını dəyişməsi Həzrətə (s) çox ağır gəldi. Həzrət Əli (ə) buyurur:

**أخبرت رسول الله (ص) بموت أبى طالب فبكى ثم قال: اذهب فاغسله و كفنه و واره غفر الله له و رحمه.**

***Mən Əbu Talibin ölüm xəbərini Həzrətə (s) verdikdə ağladı və mənə belə buyurdu: "Get ona qüsl ver, kəfənlə və torpağa tapşır! Allah onu bağışlasın və Öz mərhəmətində qərarlaşdırsın!"[50]***

**7. Peyğəmbərin (s) anası Amənə üçün ağlaması**

Bir gün Allah Rəsulu (s) Əbva şəhərində anası Amənənin qəbrini ziyarət etdi. Tarixçilərin dediyinə görə, Həzrət (s) anasının qəbrinin kənarında ağladı və yoldaşlarını da ağlatdı.[51]

---

[47] *Muhəmməd əl-Munəvi, Feyz əl-qədir, c.3, s.695*

[48] *Əl-Buxari, əs-Səhih, c.2, s.85; Müslim, əs-Səhih, "Kitab əl-fəzail", "Bab Rəhmətuhu bi əs-sibyan", c.4, s.1808; İbn Əbd Rəbbih, əl-İqd əl-fərid, "Kitab ət-təziyə", c.3, s.19; İbn Macə, əs-Sünən, "Bab ma caə fi əl-buka ala əl-meyyit", c.1, s.506, h. 1589; Əbd ər-Rəzzaq, əl-Müsənnəf, "Bab əs-səbr və əl-buka və ən-niyahə", c.3, s. 552, h.6672*

[49] *Sibt ibn əl-Cəuzi, Təzkirə əl-xəvvas, s.7*

[50] *İbn Səd, ət-Təbəqat əl-kubra, c.1, s.105*

[51] *Hakim ən-Nisaburi, əl-Müstədrək əla əs-Səhiheyn, c.1, s.357; İbn Şəbbə, Tarix əl-Mədinə, c.1, s.118*

**8. Peyğəmbərin (s) Fatimə bint Əsəd üçün ağlaması**

Əbu Talibin həyat yoldaşı və Həzrət Əlinin (ə) anası Fatimə bint Əsəd Həzrət Peyğəmbərin (s) yanında sevimli kəslərdən idi. O da həmçinin Həzrəti (s) müdafiə etmək üçün çox səy göstərmişdi. Fatimə hicrətin 3-cü ilində dünyasını dəyişdi. Peyğəmbər (s) onu öz anası kimi bildiyi üçün onun dünyadan köçməsinə qəmləndi və ağladı. Tarixçilər belə deyir:

**صلّى عليها و تمرغ فى قبرها و بكى**

***"Peyğəmbər (s) ona namaz qıldı, qəbrinin içində yatdı və ağladı."***[52]

**9. Peyğəmbərin (s) Osman ibn Məzun üçün ağlaması**

Hakim "əl-Müstədrək" kitabında deyir:

**إن النبي قبّل عثمان بن مظعون وهو ميت وهو يبكي...**

***"Peyğəmbər (s) Osman ibn Məzun öləndən sonra onu öpdü və ağladı."***[53]

**10. Peyğəmbərin (s) Uhud şəhidi olan Səd ibn Rəbi üçün ağlaması**

Vaqidi "əl-Məğazi" kitabında Cabir ibn Abdullahdan nəql edərək yazır:

**لما قتل سعد بن ربيع بأحد، رجع رسول الله صلي الله عليه وآله إلي المدينه... فدخل رسول الله صلي الله عليه وآله ودخلنا معه، قال جابر: والله ما ثمّ وساده ولا بساط. فجلسنا ورسول الله يحدثنا عن سعد بن ربيع، يترحم عليه... فلما سمع ذلك النسوه، بكين فدمعت عينا رسول الله وما نهاهن عن شيء.**

***"Səd ibn Rəbi Uhudda şəhid olandan sonra Allahın Rəsulu (s) Mədinəyə qayıtdı... Allahın Rəsulu (s) onun evinə daxil oldu, biz də Həzrətlə (s) birgə daxil olduq. And olsun Allaha ki, o evdə ev əşyaları və döşənəcək yox idi. Biz Həzrətin (s) yanında oturduq. Həzrət (s) bizim üçün Səd ibn Rəbinin şəxsiyyəti haqqında danışdı və onun üçün Allahdan rəhmət dilədi... Bu sözləri eşidən qadınlar ağlamağa başladılar. Həzrətin (s) gözləri də doldu və qadınları ağlamaqdan çəkindirmədi."***[54]

**11. Peyğəmbər (s) Ömər ibn əl-Xəttabın qadınların ağlamağının qarşısını almasını qadağan edir**

Aşağıdakı rəvayətdə Peyğəmbərin (s) hüzurunda cənazə müşayiət etmək üçün gələn bir qrup qadınların ağlamasının qarşısını Ömər ibn əl-Xəttab almaq istəyir, lakin Allah Rəsulu (s) Ömərə bu işi qadağan edir:

**خرج النبي علي جنازه ومعه عمر بن الخطاب، فسمع نساء يبكين، فزبرهن عمر فقال رسول الله (ص) يا عمر، دعهن، فإن العين دامعه والنفس مصابه والعهد قريب.**

***Peyğəmbər (s) cənazə müşayiət etmək üçün evdən çıxdı, Ömər də Onunla idi. Bu zaman qadınların ağlamaq səsləri eşidildi. Ömər sərt şəkildə onların ağlamasının***

---

*[52] Muhib əd-Din ət-Təbəri, Zəxair əl-uqba, s.56*

*[53] Hakim ən-Nisaburi, əl-Müstədrək əla əs-səhiheyn, c.1, s.514, h.1334; Əbu İsa ət-Tirmizi, əs-Sünən, "Kitab əl-cənaiz bab ma caə fi təqbil əl-meyyit", c.3, s.314, h.989; ət-Təbərani, əl-Mucəm əl-Kəbir, bab Aişə bint Qüddamə ibn Məzun əl-Cəmhiyyə, c.24, s.343, h.855; əl-Beyhəqi, əs-Sünən əl-kəbir, c.3, s.407, h 6503; əz-Zəməxşəri, Rəbi əl-əbrar, c.4, s.187; İbn əl-Əsir, Cami əl-üsul, c.11, s.105*

*[54] Əl-Vaqidi, əl-Məğazi, c.1, s.329-330; Təqi əd-Din əl-Muqrizi, İmta əl-əsma, c.13, s.269*

***qarşısını almağa çalışdı. Peyğəmbər (s) Ömərə buyurdu: "Onlardan əl çək, çünki gözləri yaşlıdırlar, canları müsibət görüb və (ölən adamı) təzəlikcə itiriblər."***[55]

Yuxarıdakı rəvayətdən bu nəticəyə gəlirik ki, bəzilərinin ölənə ağlamağı haram bilməsi Ömərin bu əməlindən götürülmüşdür. Lakin Peyğəmbərin (s) Ömərin bu əməlini qadağan etməsinə baxmayaraq yenə də bəziləri Ömərin əməlinə istinad edərək ölənə ağlamağı haram hesab edirlər.

**12. Peyğəmbər (s) ağlamağı ilahi rəhmət hesab edir**

**عن أسامه بن زيد قال:أرسلت بنت النبي (ص) أن ابنا لي قبض، فأتنا، فأرسل يقرأ السلام ويقول: إن الله له ما أخذه وله ما أعطي وكل شيء عنده بأجل مسمي، فلتصبر ولتحتسب. فأرسلت إليه تقسم عليه ليأتينها، فقام ومعه سعد بن عباده ومعاذ بن جبل وأبي بن كعب وزيد بن ثابت ورجال، فرفع رسول الله (ص) الصبي ونفسه تقعقع، ففاضت عيناه، فقال سعد: يا رسول الله، ما هذا؟ قال: رحمه يجعلها في قلوب عباده، إنما يرحم الله من عباده الرحماء**

***Üsamə ibn Zeydin belə dediyi rəvayət olunur: "Peyğəmbərin (s) qızı Ona xəbər göndərdi ki, oğlumu tutmaq istəyirlər, mənim yanıma gəl, (mənə kömək elə)! Həzrət (s) cavabında bir nəfəri göndərdi ki, ona salamını çatdırsın və desin: "Hər şey Allahdandır, O nəyi istəsə alar, nəyi istəsə verər! Hər şeyin zamanı müəyyəndir! Səbir etsin və bununla kifayətlənsin!"***

***İkinci dəfə yenə də o, Həzrətin (s) ardınca adam göndərib and verdi ki, onun yanına gəlsin! Həzrət (s) ayağa qalxdı, onunla birlikdə Səd ibn Ubadə, Məaz ibn Cəbəl, Ubeyy ibn Kəb, Zeyd ibn Sabit və bir qrup insan da ayağa qalxıb onun evinə getdilər. Həzrət (s) təngnəfəs halda və gözlərindən yaş axa-axa uşağı anasına qaytardı. Səd dedi: "Ey Allahın Rəsulu, niyə ağlayırsan?" Peyğəmbər (s) buyurdu: "Bu, Allahın bəndələrinin qəlblərində qərarlaşdırdığı bir rəhmətdir. Allah başqalarına rəhm edən bəndələrinə mərhəmət göstərər!"***[56]

---

[55] *Hakim, əl-Müstədrək əla əs-səhiheyn, "Kitab əl-cənaiz", c.1, s.381, h.1406; ən-Nəsai, Sunən əs-suğra, "Kitab əl-cənaiz", "bab ər-rüxsə fi əl-bukai əla əl-meyyit", c.4, s.19, h.1850; Əhməd ibn Hənbəl, əl-Müsnəd, "Bab musnədi Əbi Hüreyrə", c.2, s.444, h.9729; İbn Macə, əs-Sünən, "Kitab əl-cənaiz", "Babu ma caə fi əl-bukai əla əl-meyyit", c.1, s.505, h.1587*

[56] *Əl-Buxari, əs-Səhih, "Kitab əl-cənaiz", "Babu qovl ən-Nəbi yuəzzəb əl-meyyitu bibəzi bukai əhlihi", c.1, s.431, h.1224, və "Kitab əl-mərza", "Babu iyadə əs-sibyan", c.5, s.2141, h.5331 və "Kitab əl-iman və ən-nəzur", "Babu qovl Allahi-Təala "və əqsəmu billah", c.6, s.2452, h.6279; Müslim, əs- Səhih, "Kitab əl-cənaiz", "Bab əl-bukai əla əl-meyyit", c.2, s.635, h.923; ən-Nəsai, Sünən əs-suğra, "Kitab əl-cənaiz", "Bab əl-əmr bil-ihtisabi və əs-səbri ində nuzul əl-musibəh", c.4, s.22, h.1868; ən-Nəsai, Sünən əl-kubra, "Kitab əl-cənaiz", "Bab əl-əmr bil-ihtisabi və əs-səbri ində nuzul əl-musibəh", c.1, s.612, h.1995; Əbi Davud, Sünən, "Kitab əl-cənaiz", "Babu fi əl-buka əla əl-meyyit", c.3, s.193, h.3125; Əbd ər-Rəzzaq, əl-Müsənnəf, "Bab əs-səbr və əl-buka və ən-niyahə", c.3, s.551, h.6670*

## Peyğəmbər (s) sünnəsində İmam Hüseynə (ə) əzadarlıq

Peyğəmbərin (s) İmam Hüseynə (ə) olan hədsiz məhəbbəti, fövqəladə ehtiramı bir çox insanın heyrətinə, təəccübünə səbəb olmuş və olmaqdadır. Onlar bu sualı daim özlərinə verməkdədirlər ki, niyə Peyğəmbər (s) başqalarına nisbətən hər kəsdən çox Fatimeyi-Zəhranın (ə) oğlunu gözləniləndən daha çox öpür, onu ağuşuna alır və ya nəvaziş göstərirdi? Görəsən, bu hərəkət sırf daxili istəkdən meydana gəlir, yaxud da bir baba kimi öz hislərini ortaya qoyur? Yoxsa bunun başqa bir sirri var?

Bu sualın cavabını biz Peyğəmbərin (s) sünnəsini təşkil edən əməl və rəftarında araşıdaracağıq.

**1. İmam Hüseynin (ə) dünyaya gəldiyi ilk günlərdə Peyğəmbərin (s) ağlaması**

Hakimin "Müstədrək əla əs-səhiheyn"ində, İbn Əsakirin "Tarix" kitabında, Əbu əl-Muəyyəd əl-Xəvarizminin "Məqtəl əl-Hüseyn" kitabında və digər kitablarda Ümmü əl-Fəzl bint əl-Harisin belə dediyi nəql olunur:

**انها دخلت على رسول الله(ص) فقالت: يا رسول الله اني رأيت حلما منكرا الليله، قال: وما هو؟ قالت: انه شديد قال: وما هو؟ قالت: رأيت كأن قطعه من جسدك قطعت ووضعت في حجري، فقال رسول الله (ص): رأيت خيرا، تلد فاطمه – إن شاء الله – غلاما فيكون في حجرك، فولدت فاطمه الحسين فكان في حجري – كما قال رسول الله (ص) – فدخلت يوما إلى رسول الله (ص) فوضعته في حجره، ثم حانت مني التفاته فإذا عينا رسول الله (ص) تهريقان من الدموع قالت: فقلت: يا نبي الله بأبي أنت وأمي مالك؟ قال: أتاني جبرئيل عليه الصلاه والسلام فأخبرني ان امتي ستقتل ابني هذا، فقلت: هذا؟ فقال: نعم، وأتاني بتربه من تربته حمراء.**

***Ümmü əl-Fəzl Peyğəmbərin (s) xidmətinə yetişib dedi: "Ey Allahın Rəsulu (s), gecə pis bir yuxu gördüm." Həzrət (s) buyurdu: "Nə yuxu gördün?" Dedi: "Pis yuxu idi, sanki sənin bədəninin bir parçasını kəsib mənim qucağıma qoydular." Peyğəmbər (s) buyurdu: "Yaxşı yuxu görmüsən. Fatimə (ə), inşallah, yaxında bir övlad dünyaya gətirəcək və onu sənin qucağına qoyacaq." Peyğəmbərin (s) dediyi kimi də oldu, Fatimə (ə) dünyaya bir övlad gətirdi və mən o uşağı qucağıma götürdüm. Bir gün də Həzrətin (s) xidmətinə yetişdim və qucağımda olan uşağı Həzrətin (s) qucağına qoydum. Həzrətin (s) gözü mənə sataşanda gördüm ki, gözlərindən yaş axır. Dedim: "Ey Allahın peyğəmbəri, atam-anam sənə fəda olsun, nə olub?" Həzrət (s) buyurdu: "Cəbrayıl (ə) mənim yanıma gəldi və mənə xəbər verdi ki, ümmətim bu uşağı qətlə yetirəcək." Dedim: "Bu uşağı?" Buyurdu: "Bəli." Sonra mənə İmam Hüseynin (ə) qırmızı rəngli türbətindən verdi.***

Hakim bu rəvayəti nəql edəndən sonra deyir:

**هذا حديث صحيح على شرط الشيخين ولم يخرجاه.**

*"Bu, iki şeyxin (Buxari və Müslimin) şərtinə əsasən səhih hədisdir. Lakin onlar bu rəvayəti öz kitablarında qeyd etməyiblər."*[57]

### 2. Peyğəmbərin (s) İmam Hüseynin (ə) bir yaşında ona ağlaması

Əl-Xəvarizmi özünün "Məqtəl əl-Hüseyn" əsərində yazır:

**لما أتى على الحسين عليه السلام سنه كامله هبط على رسول الله صلى الله عليه وآله وسلم اثنا عشر ملكا، محمره وجوههم قد نشروا أجنحتهم، وهم يخبرون النبي بما سينزل على الحسين عليه السلام.**

*"İmam Hüseyn (ə) bir yaşına çatan zaman Peyğəmbərə (s) qanadları qana boyanmış və üzləri pərişan on iki mələk nazil oldu. Onlar Həzrətə (ə) İmam Hüseynin (ə) başına gələcək hadisələrdən xəbər verdilər."*[58]

Baxmayaraq ki, yuxarıdakı rəvayətdə Peyğəmbərin (s) ağlaması açıqca göstərilməyib, lakin başqa rəvayətlərin nəticəsinə görə, Həzrətin (s) ağlamasını yəqinliklə demək olar.

### 3. Peyğəmbərin (s) İmam Hüseynin (ə) iki yaşında ona ağlaması

**عن ابن عباس قال: فلما أتت على الحسين من مولده سنتان كاملتان خرج النبي صلى الله عليه وآله وسلم في سفر له، فلما كان في بعض الطريق وقف فاسترجع ودمعت عيناه، فسئل عن ذلك، فقال: هذا جبريل يخبرني عن أرض بشاطئ الفرات يقال لها كربلا، يقتل بها ولدي الحسين ابن فاطمه، فقيل: من يقتله يا رسول الله؟ فقال: رجل يقال له يزيد، لا بارك الله له في نفسه! وكأني أنظر إلى مصرعه ومدفنه بها، وقد أهدي برأسه، واللّه ما ينظر أحد إلى رأس ولدي الحسين فيفرح إلّا خالف اللّه بين قلبه ولسانه.**

**قال: ثم رجع النبي صلى الله عليه وآله وسلم من سفره ذلك مغموما ثم صعد المنبر فخطب ووعظ والحسين بن علي بين يديه مع الحسن، قال: فلما فرغ من خطبته وضع يده اليمنى على رأس الحسن واليسرى على رأس الحسين ثم رفع رأسه إلى السماء فقال: اللهم! إني محمد عبدك ونبيك وهذان أطايب عترتي وخيار ذريتي وأرومتي ومن أخلفهم في أمتي، اللهم! وقد أخبرني جبريل بأن ولدي هذا مقتول مخذول، اللهم! فبارك له في قتله واجعله من سادات الشهداء، إنك على كل شيء قدير، اللهم! ولا تبارك في قاتله وخاذله. قال: وضجّ الناس في المسجد بالبكاء. فقال النبي صلى الله عليه وآله وسلم: أتبكون ولا تنصرونه! اللهم! فكن أنت له وليا وناصرا.**

**قال ابن عباس: ثم رجع وهو متغير اللون محمر الوجه فخطب خطبه بليغه موجزه وعيناه يهملان دموعا ثم قال: أيها الناس! إني قد خلفت فيكم الثقلين كتاب الله وعترتي وأرومتي ومراح مماتي وثمرتي، ولن يفترقا حتى يردا عليّ الحوض، ألا! وإني أسألكم في ذلك إلا ما أمرني ربي أن أسألكم الموده في القربى، فانظروا أن لا تلقوني غدا على الحوض وقد أبغضتم عترتي وظلمتموهم،... ألا! وإن جبريل عليه السلام قد أخبرني بأن أمتي تقتل ولدي الحسين بأرض كرب وبلاء. ألا! فلعنه الله على قاتله وخاذله آخر الدهر. قال: ثم نزل على المنبر، ولم يبق أحد من المهاجرين والأنصار إلا واستيقن أن الحسين مقتول.**

---

[57] *Hakim, əl-Müstədrək əla əs-səhiheyn, c.3, s.176 və İxisarla c.3, s.179; əl-Heysəmi, Məcmə əz-zəvaid, c.9, s.179; Əbu əl-Muəyyəd əl-Xəvarizmi, Məqtəl əl-Hüseyn, c.1, s.159 və başqa ibarə ilə s. 162; İbn Kəsir, əl-Bidayə və ən-nihayə, c.6, s.230 və işarə edərək c.8, s.199; əs-Səcri, Əmali, s.188; İbn Səbbağ əl-Maliki, əl-Füsul əl-muhimmə, s.154; əl-Heytəmi, əs-Səvaiq əl-muhriqə, s.115; Muttəqi əl-Hindi, Kənz əl-ummal, qədim çap, c.6, s.223; Cəlal əd-Din əs-Süyuti, əl-Xəsais əl-kubra, c.2, s.125*

[58] *Əbu əl-Muəyyəd əl-Xəvarizmi, Məqtəl əl-Hüseyn, c.1, s.163*

*İbn Abbasın belə dediyi rəvayət olunur: "İmam Hüseyn (ə) iki yaşına çatanda Peyğəmbər (s) səfərdə idi. Yolun ortasında dayandı, "Hamımız Allah üçünük və Ona tərəf qayıdacağıq" ayəsini oxudu və gözlərindən yaş axdı. Bunun səbəbini soruşduqda Həzrət (s) buyurdu: "Cəbrayıl (ə) mənə Fərat çayının sahilində yerləşən Kərbəla adlı məntəqə haqqında xəbər verib buyurdu ki, bu yerdə övladım Hüseyn ibn Fatimə (ə) şəhadətə çatacaqdır." Soruşdular: "Ey Allahın Rəsulu (s), kim onu şəhadətə çatdıracaqdır?" Həzrət (s) buyurdu: "Onu Yezid adlı bir şəxs şəhid edəcəkdir, Allah ondan Öz bərəkətini götürsün! Sanki mən Hüseynin (ə) qətlgahını və dəfn olunduğu yeri, hədiyyə aparmaq üçün başının kəsildiyini görürəm. And olsun Allaha ki, oğlum Hüseynin (ə) kəsilmiş başına baxıb sevinənlərin qəlbi ilə dili arasında Allah ayrılıq salacaq."*

*İbn Abbas davamında deyir: "Sonra Peyğəmbər (s) səfərdən qayıtdı, həzin halda minbərə çıxdı və camaat üçün xütbə oxuyub moizə elədi. İmam Həsən (ə) və İmam Hüseyn (ə) də Həzrətin (s) yanında idi. Həzrət (s) xütbəni bitirən kimi sağ əlini İmam Həsənin (ə) başına, sol əlini isə İmam Hüseynin (ə) başına qoydu, sonra başını göyə qaldıraraq ərz etdi: "Ya Allah, mən sənin bəndən və peyğəmbərin olan Məhəmmədəm (s). Bu iki nəfər də mənim pak itrətim, övladlarım və yer üzündə olan canişinlərimdir. Ya Allah, Cəbrayıl (ə) mənə xəbər verdi ki, mənim bu oğlum alçaqcasına öldürüləcək. Ya Allah, onun qətlini mübarək qərar ver, onu şəhidlərin sərvəri qərar ver! Çünki Sən hər şeyə qadirsən! Onu alçaqcasına öldürənə bərəkətini nazil etmə!"*

*İbn Abbas deyir: "Məsciddə olanlar fəryad edib ağlamağa başladılar." Peyğəmbər (s) buyurdu: "Ağlayırsınızmı və ona kömək etməyəcəksinizmi? Ya Allah, Sən Özün onun himayədarı və köməkçisi ol!"*

*İbn Abbas deyir: "Sonra yenidən Həzrət (s) üzü qızarmış və rəngi dəyişmiş vəziyyətdə minbərə qayıtdı, qısa, lakin çox bəlağətli bir xütbə oxudu. Bu xütbəni Həzrət (s) gözləri yaşla dolu bir halda oxudu." Sonra buyurdu: "Ey insanlar, mən sizin aranızda iki ağır əmanət qoyub gedirəm. Biri Allahın kitabıdır. Digəri isə ölümümün rahatlıq səbəbi, qəlbimin meyvəsi olan itrətimdir. Bu ikisi cənnətdə, Kövsər hovuzunun kənarında mənə yetişənədək bir-birindən ayrılmazlar. Agah olun, mən Allahın məndən onlar barəsində istədiyindən başqa sizdən bir şey istəmirəm. Bu da yaxınlarıma olan sevgidən başqa bir şey deyildir. Ehtiyatlı olun ki, sabah hovuzun kənarında itrətimə qarşı olan kin və zülmünüzlə mənimlə görüşməyəsiniz... Agah olun, Cəbrayıl (ə) mənə xəbər verdi ki, mənim ümmətim oğlum Hüseyni (ə) çətinlik və bəla ilə dolu olan bir yerdə (Kərbəlada) öldürəcək. Allah onun qatilinə dünyanın sonunadək lənət eləsin!"*

*Sonra Həzrət (s) minbərdən endi. Mühacir və Ənsarın hər biri Hüseynin (ə) qətlə yetiriləcəyinə yəqin etdilər."*[59]

[59] *Əhməd ibn Əsəm əl-Kufi, əl-Futuh, c. 4, s. 325*

**4. Ümmətin ailəsinə kin-küdurət bəsləyəcəyi ilə əlaqədar Həzrətin (s) ağlaması**

روى يونس بن حباب، عن أنس بن مالك قال: كنا مع رسول الله صلى الله عليه وآله وسلم وعلي بن أبي طالب عليه السلام معنا، فمررنا بحديقه، فقال علي عليه السلام: يا رسول الله! ألا ترى ما أحسن هذه الحديقه؟ فقال: إن حديقتك في الجنه أحسن منها. حتى مررنا بسبع حدائق، يقول علي عليه السلام ما قال ويجيبه رسول الله صلى الله عليه وآله وسلم بما أجابه، ثم إن رسول الله وقف فوقفنا، فوضع رأسه على رأس علي وبكي، فقال علي عليه السلام: ما يبكيك يا رسول الله؟! قال: ضغائن في صدور قوم لا يبدونها لك حتى يفقدوني.

***Yunis ibn Həbban Ənəs ibn Malikdən belə rəvayət edir: "Biz Allahın Rəsulu (s) ilə birlikdə idik. Əli ibn Əbu Talib də bizimlə idi. Mədinə ətrafında olan bağların birindən keçirdik. Əli (ə) ərz elədi: "Ey Allahın Rəsulu (s), görürsənmi bu bağ necə gözəldir?" Peyğəmbər (s) buyurdu: "Sənin cənnətdə olan bağın bu bağdan daha gözəldir." Yeddi belə bağın içindən keçdik, hər bağa yetişəndə bu iki böyük şəxsiyyət arasında eyni dialoq baş verdi. Sonra Peyğəmbər (s) dayandı, biz də dayandıq. Həzrət (s) başını Əlinin (ə) başına qoyaraq ağladı. Əli (ə) ərz elədi: "Ey Allahın Rəsulu (s), səni nə ağlatdı?" Həzrət (s) buyurdu: "Bu tayfa sənə qarşı olan kin və düşmənçiliklərini mən dünyadan gedənədək üzə çıxarmayacaqlar."[60]***

**5. Ümmü Sələmənin hədisi**

Ümmü Sələmə Peyğəmbərin (s) pak təbiətli və böyük şəxsiyyətli həyat yoldaşlarından biri olmuşdur. O, Peyğəmbərin (s) sirə və həyatında olan mühüm hissələri nəql etmişdir. O, Peyğəmbərin (s) İmam Hüseyn (ə) üçün ağlaması macərasını belə nəql edir:

كان رسول الله صلى الله عليه وسلم جالسا ذات يوم في بيتي قال لا يدخل على أحد فانتظرت فدخل الحسين فسمعت نشيج رسول الله صلى الله عليه وسلم يبكى فأطلت فإذا حسين في حجره والنبي صلى الله عليه وسلم يمسح جبينه وهو يبكي فقلت والله ما علمت حين دخل فقال إن جبريل عليه السلام كان معنا في البيت قال أفتحبه قلت أما في الدنيا فنعم قال إن أمتك ستقتل هذا بأرض يقال لها كربلاء فتناول جبريل من تربتها فأراها النبي صلى الله عليه وسلم...

***"Bir gün Həzrət Rəsul (s) mənim evimdə oturmuşdu və belə buyurdu: "Heç kəs mənim yanıma girməsin!" Mən də bayırda gözlədim. Bu zaman Hüseyn (ə) evə daxil oldu. Otaqdan ağlamaq səsi eşitdim. Araşdırma aparmaq üçün otağa daxil oldum. Gördüm ki, Hüseyn (ə) Peyğəmbərin (s) dizinin üstündə oturmuş, Həzrət (s) də onun başına əl çəkərək ağlayırdı. Ərz elədim: "And olsun Allaha, Hüseynin (ə) evə daxil olmasından xəbərim olmayıb, (yoxsa sizin otağınıza girməsinin qarşısını alardım)". Həzrət (s) buyurdu: "İndi Cəbrayıl (ə) bizimlə idi, məndən soruşdu: "Hüseyni (ə) sevirsənmi?" Dedim: "Bəli." Dedi: "Tezliklə sənin ümmətin Hüseyni (ə) Kərbəla adlı bir yerə qətlə yetirəcək." Cəbrayıl (ə) Hüseynin (ə) türbətindən mənə göstərdi..."[61]***

Əl-Heysəmi bu rəvayəti nəql edəndən sonra deyir:

رواه الطبراني بأسانيد ورجال أحدها ثقات.

---

*[60] İbn Həcər əl-Heysəmi, Məcmə əz-zəvaid, c.9, s.118; Müttəqi əl-Hindi, Kənz əl-ummal, c.13, s.176; İbn Əbi əl-Hədid, Şərh Nəhc əl-bəlağə, c.4, s.107; Əbu əl-Muəyyəd əl-Xəvarizmi, Məqtəl əl-Hüseyn, s. 65; Süleyman əl-Qunduzi, Yənabi əl-məvəddə, c.1, s.134*

*[61] İbn Həcər əl-Heysəmi, Məcmə əz-zəvaid, c.9, s.189*

*"Bu rəvayəti Təbərani müxtəlif sənədlərlə nəql etmişdir. Onlardan birinin bütün ravilәri siqәdir."*[62]

Ümmü Sәlәmә başqa bir hәdisdә deyir:

**قال لي رسول الله صلى الله عليه وسلم اجلسي بالباب ولا يلجن علي أحد فقمت بالباب إذ جاء الحسين رضي الله عنه فذهبت أتناوله فسبقني الغلام فدخل على جده فقلت يا نبي الله جعلني الله فداك أمرتني أن لا يلج عليك أحد وإن ابنك جاء فذهبت أتناوله فسبقني طال ذلك تطلعت من الباب فوجدتك تقلب بكفيك شيئا ودموعك تسيل والصبي على بطنك قال نعم أتاني جبريل فأخبرني أن أمتي يقتلونه وأتاني بالتربه التي يقتل عليها فهي التي أقلب بكفي**

*"Peyğәmbәr (s) mәnә buyurdu: "Qapıda otur vә heç kәsi içәri daxil olmağa qoyma!" Mәn otağın qapısının ağzında oturdum. Hüseyn (ә) evә daxil oldu. İstәdim ki, onu Peyğәmbәrin (s) otağına girmәsinә mane olum, lakin o, otağa mәndәn tez daxil oldu. Mәn dә içәri daxil olub dedim: "Ey Allahın Peyğәmbәri (s), siz mәnә әmr etmişdiniz ki, otağa heç kәsi qoymayım, lakin sәnin oğlun gәldi, istәdim durub içәri girmәsinә mane olum, o, mәndәn әvvәl otağa daxil oldu."*

*Uzun bir müddәt sonra yenidәn içәri daxil oldum. Gördüm ki, Hәzrәtin (ә) hәr iki әlindә bir şey var, gözlәrindәn yaş axır, Hüseyn (ә) Hәzrәtin (s) qucağındadır. Bunun sәbәbini soruşdum. Hәzrәt (s) buyurdu: "Bәli, Cәbrayıl (ә) indi mәnә nazil oldu vә mәnә xәbәr verdi ki, mәnim ümmәtim bu uşağı qәtlә yetirәcәk. Bir az da Hüseynin (ә) türbәtindәn mәnim üçün gәtirdi. İndi hәmin torpaq mәnim әlimdәdir."*[63]

## 6. Aişәnin hәdisi

Peyğәmbәrin (s) başqa bir xanımı olan Aişә deyir:

**دخل الحسين بن علي رضي الله عنهما على رسول الله صلى الله عليه وسلم وهو يوحى إليه فنزا على رسول الله صلى الله عليه وسلم وهو منكب وهو على ظهره فقال جبريل لرسول الله صلى الله عليه وسلم أتحبه يا محمد قال يا جبريل ومالي لا أحب ابني قال فان أمتك ستقتله من بعدك فمد جبريل عليه السلام يده فأتاه بتربه بيضاء فقال في هذه الأرض يقتل ابنك هذا واسمها الطف فلما ذهب جبريل عليه السلام من عند رسول الله صلى الله عليه وسلم خرج رسول الله صلى الله عليه وسلم والتزمه في يده يبكي فقال يا عائشه إن جبريل أخبرني أن ابني حسين مقتول في أرض الطف وان أمتي ستفتن بعدي ثم خرج إلى أصحابه فيهم على وأبو بكر وعمر وحذيفه وعمار وأبو ذر رضي الله عنهم وهو يبكي فقالوا ما يبكيك يا رسول الله فقال أخبرني جبريل عليه السلام ان ابني الحسين يقتل بعدي بأرض الطف وجاءني بهذه التربه وأخبرني أن فيها مضجعه.**

*"Hüseyn ibn Әli (ә) Peyğәmbәrin (s) otağına daxil oldu. Peyğәmbәrә (s) vәhy nazil olurdu. Hәzrәt (s) arxasını dayamışdı. Cәbrayıl (ә) Peyğәmbәrә (s) dedi: "Ya Mәhәmmәd (s), Hüseyni (ә) sevirsәnmi?" Hәzrәt (s) buyurdu: "Ya Cәbrayıl (ә), niyә öz oğlumu sevmәyim ki?" Cәbrayıl (ә) dedi: "Sәnin ümmәtin sәndәn sonra onu qәtlә yetirәcәk!" Sonra Cәbrayıl (ә) әlini uzadıb Hüseynin (ә) ağ rәngli türbәtindәn Hәzrәtә (s) gәtirib dedi: "Adı Tәff olan bu yerdә oğlun qәtlә yetirilәcәkdir." Cәbrayıl (ә) gedәndәn sonra Hәzrәt әlindә türbәt, ağlayaraq bayıra çıxdı vә buyurdu: "Ya Aişә,*

[62] *Hәmin mәnbә*

[63] *Әt-Tәbәrani, әl-Mucәm әl-kәbir, c.3, s.109; İbn Rәhaveyh, әl-Müsnәd, c.4, s.131*

*Cəbrayıl (ə) mənə xəbər verdi ki, oğlum Hüseyn (ə) Təff adlı yerdə qətlə yetiriləcək və mənim ümmətim məndən sonra fitnə törədəcək." Sonra Həzrət (ə) səhabələrin yanına gedib ağladı. Səhabələrin içində Əli (ə), Əbu Bəkr, Ömər, Hüzeyfə, Əmmar, Əbu Zərr də var idi. Soruşdular: "Ey Allahın Rəsulu (s) səni ağladan nədir?" Həzrət (s) buyurdu: "Cəbrayıl (ə) mənə xəbər verdi ki, oğlum Hüseyn (ə) Təff adlı yerdə qətlə yetiriləcək və mənə bu türbəti verdi. Mənə xəbər verdi ki, Hüseyn (ə) bu torpaqda dəfn ediləcək."*[64]

## 7. İmam Hüseynin (ə) şəhadətindən sonra Peyğəmbərin (s) əzadarlıq etməsi

حَدَّثَنَا أَبُو سَعِيدٍ الْأَشَجُّ حَدَّثَنَا أَبُو خَالِدٍ الْأَحْمَرُ حَدَّثَنَا رَزِينٌ قَالَ حَدَّثَتْنِي سَلْمَى قَالَتْ دَخَلْتُ عَلَى أُمِّ سَلَمَه وَهِيَ تَبْكِي فَقُلْتُ مَا يُبْكِيكِ قَالَتْ رَأَيْتُ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ تَعْنِي فِي الْمَنَامِ وَعَلَى رَأْسِهِ وَلِحْيَتِهِ التُّرَابُ فَقُلْتُ مَا لَكَ يَا رَسُولَ اللَّهِ قَالَ شَهِدْتُ قَتْلَ الْحُسَيْنِ آنِفًا

*Əbu Səid əl-Əşəc bizə rəvayət etdi (və dedi): Əbu Xalid əl-Əhmər bizə rəvayət etdi (və dedi): Rəzin bizə rəvayət etdi (və dedi): Səlma mənə rəvayət etdi (və dedi): "Ümmü Sələmənin yanına daxil oldum, o ağlayırdı." Ona dedim: "Səni ağladan nədir?" Dedi: "Peyğəmbəri (s) yuxuda gördüm. Başı, saqqalı torpaqlı idi. Dedim: "Ey Allahın Rəsulu (s), nə olub sənə?" Dedi: "Bir az bundan əvvəl Hüseynin (ə) qətlə yetirilməsinin şahidi oldum."*[65]

---

[64] *Ət-Təbərani, əl-Mucəm əl-kəbir, c.3, s.107; Əl-Heysəmi, Məcmə əz-zəvaid, c.9, s.187; İbn Əsakir, c.7, s.260*

[65] *Əbu İsa ət-Tirmizi, əs-Sünən, "Babu fəzail əs-səhabə", "babu mənaqib əl-Həsən (ə) və əl-Hüseyn (ə)", c.12, s.195,*

# Məsumların (ə) sirəsində İmam Hüseynin (ə) əzadrlığı

**a) Kərbəla vaqiəsindən illər əvvəl Əmir əl-mömininin (ə) ağlaması**

Şiənin hədis mənbələrində Əmir əl-möminindən (ə) nəql olunmuş bir çox rəvayətlər vardır. Belə ki, o Həzrət (ə) Peyğəmbər (s) kimi oğlu Hüseynin (ə) qətlə yetirliməsini eşidəndə ağlamışdır. Biz bu barədə əhli-sünnənin mənbələrindən iki nümunə ilə kifayətlənirik.

Nucəy əl-Həzrəmi deyir:

**انه سار مع علي رضي الله عنه وكان صاحب مطهرته فلما حاذى نينوى وهو منطلق إلى صفين فنادى على اصبر أبا عبد الله اصبر أبا عبد الله بشط الفرات قلت وما ذاك قال دخلت على النبي صلى الله عليه وسلم ذات يوم وإذا عيناه تذرفان قلت يا نبي الله أغضبك أحد ما شأن عينيك تفيضان قال بل قام من عندي جبريل عليه السلام قيل فحدثني ان الحسين يقتل بشط الفرات قال فقال هل لك ان أشمك من تربته قلت نعم قال فمد يده فقبض قبضه من تراب فأعطانيها فلم أملك عيني ان فاضتا.**

***"Əli (ə) ilə Siffeyn döyüşünə gedəndə Neynəva adlı bir yerə yetişdik. Həzrət (ə) uca səslə buyurdu: "Ya Əba Əbdillah, Furat kənarında səbrli olasan!" Bu cümləni iki dəfə təkrar etdi. Dedim: "Bu nə sözdür?" Buyurdu: "Bir gün Peyğəmbərin (ə) yanına getdim. Gördüm ki, mübarək gözləri yaşla dolub. Ərz etdim: "Ey Allahın Peyğəmbəri (ə), səni kim qəzəbləndirmişdir ki, belə ağlayırsan?" Buyurdu: "Bir az bundan əvvəl Cəbrayıl (ə) mənim yanıma gəlmişdi. Mənə Hüseynin (ə) Furat kənarında öldürüləcəyini xəbər verib dedi: "Hüseynin (ə) türbətindən iyləmək istəyirsənmi?" Dedim: "Bəli." Əlini uzadıb Hüseynin (ə) şəhadətə çatacağı türbətdən bir ovuc mənə verdi. Dözə bilmədim və ağlamağımın qarşısını ala bilmədim."***

Əl-Heysəmi bu rəvayəti nəql etdikdən öz nəzərini belə qeyd etmişdir:

**رواه أحمد وأبو يعلى والبزار والطبراني ورجاله ثقات ولم ينفرد نجى بهذا.**

***"Bu hədisi Əhməd, Əbu Yəla, əl-Bəzzar, ət-Təbərani rəvayət etmişlər və raviləri siqədir. Bu hədisi digərləri də rəvayət etmişdir."*[66]**

"Əs-Səvaiq əl-muhriqə" kitabının müəllifi İbn Həcər əl-Heytəmi Şöbədən belə nəql edir:

**مر علي رضي الله عنه بكربلاء عند مسيره إلى صفين وحاذى نينوى قريه على الفرات فوقف وسأل عن اسم هذه الأرض فقيل كربلاء فبكى حتى بل الأرض من دموعه ثم قال دخلت على رسول الله e وهو يبكي فقلت ما يبكيك قال: كان عندي جبريل آنفا وأخبرني أن ولدي الحسين يقتل بشاطىء الفرات بموضع يقال له كربلاء ثم قبض جبريل قبضه من تراب شمني إياه فلم أملك عيني أن فاضتا.**

***"Həzrət Əli (ə) Siffeynə gedən zaman Fərata yaxın yerdə Neynəvaya yetişdi. Dayandı və bu yerin adını soruşdu. Dedilər ki, bu yerin adı Kərbəladır. Bu adı eşidən kimi o qədər ağladı ki, yer Həzrətin (ə) göz yaşları ilə islandı. Buyurdu: "Allah Rəsulunun (s) məhzərində idim, Həzrət (s) ağlayırdı." Ərz etdim: "Səni ağladan nədir?" Buyurdu: "Bir az bundan əvvəl Cəbrayıl (ə) yanımda idi və mənə xəbər verdi***

---

[66] *İbn Həcər əl-Heysəmi, Məcmə əz-zəvaid, c.9, s.187*

***ki, oğlum Hüseyn (ə) Fərat kənarında, Kərbəla adlı yerdə qətlə yetiriləcək." Sonra o yerin türbətindən bir az iyləmək üçün mənə verdi. Bu zaman gözlərim yaşla doldu."*[67]**

### b) Məhşərdə Həzrət Fatimənin (ə) əzadarlıq etməsi

Həzrət Fatimənin (ə) Məhşərdə simvolik hərəkəti İmam Hüseyn (ə) üçün əzadarlıq mərasimlərini təşkil etmək üçün ən möhkəm dəlil olacaq. Buna görə də təkcə Peyğəmbərin (s) yeganə yadigarı olan Həzrət Zəhraya (ə) tabe olmaq İmam Hüseynə (ə) əzadarlıq məclislərini təşkil etməkdə risalət ailəsinin gözəl üslublarına tabe olmaqdır.

Əli ibn Məhəmməd əş-Şafei əl-Məğazəli, Əbu Əhməd Amirdən, o da Həzrət Əli ibn Musa ər-Rzadan (ə), o da hörmətli atalarından, onlar da Əmir əl-möminindən (ə) Peyğəmbərin (s) belə buyurduğunu nəql edir:

**تحشر ابنتي فاطمه ومعها ثياب مصبوغه بدمٍ، فتتعلّق بقائمه من قوائم العرش وتقول: ياعدل! ياجبّار! أُحكم بيني وبين قاتل ولدي قال صلّي الله عليه وآله وسلّم: فيحكم لابنتي وربّ الكعبه.**

***"Qızım Fatimə (ə) qiyamət günü qanlı paltarla məşhur olacaq. Bu zaman əlini Allahın ərşinin sütunlarından birinə qoyaraq buyuracaq: "Ey Cabbar və Adil Allah, mənimlə oğlum Hüseynin (ə) qatili arasında hökm et!" And olsun Kəbənin Rəbbinə ki, Allah-Təala Özünə xas surətdə qızım barəsində hökm edəcək."*[68]**

Buna əsasən, Əhli-Beyti (ə) sevənlər İmam Hüseynin (ə) əzadarlığı barəsində Məsumlardan (ə) nəql olunan ruhi hallara diqqət etsələr, Kərbəlanın qanlı hadisəsi olan Həzrət Zəhranın (ə) oğlunun və onların dostlarının şəhadətini Həzrət Hüseynin (ə) məzlum anasının qiyamət günündə Allah hüzurunda oğlunun haqqını istəyənədək unutmasınlar.

### c) Şiə İmamlarının (ə) əzadarlıq edib ağlamaları

Tarixin nəql etdiyinə görə, İmam Hüseynin (ə) şəhadətindən sonra İmamların (ə) üslubu bu olmuşdur ki, onlar (ə) əzadarlıq məclislərini təşkil edərək, İmam Hüseynin (ə) müsibətlərinə ağlamışlar. Onlar əslində rövzəxanlıq düşüncəsinin əsasını qoymuş, bu işə rəvac vermişlər. Zaman keçdikcə bu məsələ şiələrin düşüncəsində bir mədəniyyət kimi formalaşmışdır.

Buna görə də bu gün şiə məntəqələrində formalaşıb yayılan əzadarlıq məclisləri yeni meydana gələn, biganə insanların əli ilə düzələn və ya başqa firqələrə təqlid etməklə formalaşan məclislər deyil, əksinə, məsum İmamların (ə) həyatlarında yaşadıqları, ona təkid etdikləri işin davam etdirilməsindən ibarətdir. İmamların (ə) dinin şüarlarının bərpası barəsində, xüsusilə İmam Hüseynin (ə) şəhadətinin il dönümündə əza məclislərinin təşkil edilməsi barəsində söylədikləri bir çox bəyanatlar bu mübarək sünnəni qüvvətləndirir. Onlar (ə) belə məclislərdə axıdılan bir damla göz yaşının mükafatı olacağını vədə vermişlər.

Neynəva çölünün məşhur şəhidi Həzrət İmam Hüseynin (ə) buyurduğu hədis də bu qəbildəndir:

**من دمعت عيناه فينا دمعه، أو قطرت عيناه فينا قطره، آتاه اللّه عزّ وجلّ الجنّه.**

---

*[67] Əhməd ibn Həcər əl-Heytəmi, əs-Səvaiq əl-muhriqə, s.193*

*[68] İbn Məğazəli, Mənaqib Əli ibn Əbi Talib, s.66; Süleyman əl-Qunduzi, Yənabi əl-məvəddə li zəvi əl-qurba, c.3, s.47*

*"Hər kəs bizim əzamızda bir damla göz yaşı axıtsa, Allah-Təala ona cənnəti əta edir."*[69]

Bu rəvayət Əhməd ibn Hənbəlin "Fəzail əs-səhabə" kitabında da mötəbər sənədlə gəlmişdir. Əbu Bəkr ibn Malik əl-Qətii Əhməd ibn Hənbəlin "Fəzail əs-səhabə" kitabının ziyadəsində (əlavəsində) rəvayət edir:

**حدثنا أحمد بن إسرائيل قال : رأيت في كتاب أحمد بن محمد بن حنبل رحمه الله بخط يده : نا أسود بن عامر أبو عبد الرحمن قثنا الربيع بن منذر ، عن أبيه قال : كان حسين بن علي يقول : من دمعتا عيناه فينا دمعة ، أو قطرت عيناه فينا قطرة ، أثواه الله عز وجل الجنة.**

***Əhməd ibn İsrail bizə dedi ki, Əhməd ibn Muhəmməd ibn Hənbəlin bir kitabda öz xətti ilə belə yazdığını gördüm: Əsvəd ibn Amir Əbu Əbd ər-Rəhman deyir ki, Rəbi ibn Munzir atasından nəql edir ki, Hüseyn ibn Əli buyurur: "Kimin gözləri bizə görə yaşarsa, və ya bir damla göz yaşı axıtsa Uca Allah onu Cənnətdə məskunlaşdırar."***

Mühəqqiq Vəsiyullah ibn Əhməd Abbas haşiyədə yazır yazır:

**أحمد بن إسرائيل شيخ القطيعي لم أجده والباقون ثقات .الربيع بن منذر بن يعلى الثوري ثقة وثقه ابن معين.**

***"Əhməd ibn İsrail əl-Qətiinin şeyxlərindəndir. Amma onu müəyyən edə bilmədim, digər raviləri isə siqə (güvənilən) şəxslərdir."***[70]

Dr.Vəsiyullahın da qeyd etdiyi kimi Əhməd ibn İsrailin məchul olduğu deyilir. Bununla bərabər o, digər bütün ravilərin siqə olduğunu bildirmişdir. Deməli, Dr.Vəsiyullahın rəyinə əsasən Əhməd ibn İsraili problemi həll olunsa, başqa məsələ qalmır və rəvayətin sənədi mötəbərdir.

Əhməd ibn İsrail – onun dörd adı var ki, həmin adlarda atasına deyil, babalarına istinad edilib. Bu barədə əl-Xətib əl-Bağdadi yazır:

**ذكرُ أبي بكر أحمد بن سلمان بن الحسن النجاد**

***Əbu Bəkr Əhməd ibn Salman ibn Həsən ən-Nəccad...***

**هو: أحمد بن يونس القطيعي**

***o, Əhməd ibn Yunus əl-Qətiidir***

**وهو: أحمد بن سلمان بن الحسن بن إسرائيل نسب إلى جد جده،**

***həmçinin o, Əhməd ibn Salman ibn Həsən ibn İsraildir ibn Yunusdur, Ömər onu babasının babasına nisbət vermişdir,***

**وهو أحمد بن إسرائيل الذي روى عنه أبو بكر بن مالك القطيعي.**

***həmçinin o, Əbu Bəkr ibn Malik əl-Qətiinin ondan rəvayət etdiyi Əhməd ibn İsraildir.***[71]

---

[69] *Muhib əd-Din ət-Təbəri, Zəxair əl-uqba, s.19; Suleyman əl-Qunduzi, Yanəbi əl-məvəddə, c.2, s.117*

[70] *Əhməd ibn Hənbəl, Fəzail əs-səhabə, c.2, s.840-841, h.1154; Dar İbn Cəuzi, Ciddə, Səudiyyə Ərəbistanı; təhqiq: Vəsiyullah bin Əhməd Abbas*

[71] *əl-Xətib əl-Bağdadi, əl-Muvazzah əhvam əl-cəm və ət-təfriq, c.1, s.464; Dar əl-Marifə, Beyrut, 1407/1987; təhqiq: Əbd əl-Muti Əmin Qəlaci*

Həmçinin, "Tarixi Bağdad" kitabının 4-cü cildində (bəzi nəşrlərdə 5-ci cild) əl-Xətib deyir:

وَكَانَ صدوقا عارفا، جمع المسند وصنف فِي السنن كتابا كبيرا .رَوَى عَنْهُ أَبُو بَكْرِ بْنُ مالك القطيعي، والدارقطني، وابن شاهين، وغيرهم من المتقدمين.

***"O, doğrudanışan və arif şəxs idi. "əl-Müsnəd" (adında kitab) toplamış və sünnə barədə böyük bir kitab yazmışdır. Ondan Əbu Bəkr ibn Malik əl-Qətii, əd-Darəqutni, İbn Şahin və digər qədim alimlər rəvayət etmişlər."***[72]

Şəms əd-Din əz-Zəhəbi onun barəsində yazır:

الإمام، المحدث، الفقيه ، الحافظ ، المفتي ، شيخ العراق ...، حدث عنه أبو بكر القطيعي...

***"İmam, mühəddis, fəqih, hafiz, müfti və İraq şeyxidir... Ondan Əbu Bəkr əl-Qətii hədis nəql etmişdir..."***[73]

Beləliklə, Dr.Vəsiyullah ibn Muhəmməd Abbas sadəcə olaraq ravi barədə məlumat tapa bilməmişdir, ancaq göründüyü kimi ravi məlumdur və etibarlı şəxsdir. Dr.Vəsiyullahın başqa heç bir iradı olmamışdır və o digər ravilərin hamısının siqə şəxslər olduğunu bildirmişdir.

Biz bu rəvayətin daha ətraflı analizini ayrıca məqalədə təqdim etmişik. Maraqlanan oxucularımız http://az.313news.net/ saytının məqalələr bölməsinə daxil olub oxuya bilərlər.[74]

Kərbəla hadisəsindən sonra İmam Səccadın (ə) göz yaşları bir an dayanmadı. Onu bu halda görənlər bunun səbəbini soruşdular. Həzrət (ə) cavabında buyurdu:

لا تلوموني، فإنّ يعقوب فقد سبطاً من ولده، فبكي حتّي ابيضّت عيناه من الحزن، ولم يعلم أنّه مات، وقد نظرتُ إلي أربعه عشر رجلاً من أهل بيتي يذبحون في غداه واحده، فترون حزنهم يذهب من قلبي أبدا.

***"Məni danlamayın! Həzrət Yəqub (ə) övladlarından birini itirdi, o qədər ağladı ki, gözlərinin görmə qabiliyyətini əlindən verdi. O övladın ölməsi də məlum deyildi. Lakin mənim gözümün qarşısında ailəmdən bir gün ərzində 14 nəfərin başını kəsdilər. Siz güman edirsiniz ki, bu qəm-qüssə məndən əbədi olaraq uzaqlaşacaq?"***[75]

Həmişəlik olan qəm-qüssə faciənin dərinliyinə dəlildir. Digər tərəfdən də İmam Səccad (ə) bu əməli ilə hidayət bəxş edən bu xəbəri bütün möminlərə çatdırır ki, Aşura və İmam Hüseyn (ə) qiyamətədək diri qalsın.

İmam Baqir (ə) atası İmam Səccaddan (ə) Aşura hadisəsinin əbədi qalması üçün ona təkid etməsinə və atasının əməli üslubu olan əzadarlıq məclislərinin keçirilməsinə aid bir hədis nəql etmişdir:

كان أبي عليّ بن الحسينعليه السلام يقول: أيّما مؤمن دمعت عيناه لقتل الحسين ومن معه، حتّي تسيل علي خدّيه، بوّأه اللّه في الجنّه غرفاً، وأيّما مؤمن دمعت عيناه دمعاً حتّي يسيل علي خدّيه، لأذي مسّنا من عدوّنا بوّأه اللّه مبوّء صدق.

---

[72] *əl-Xətib əl-Bağdadi, Tarixi Bağdad, c.4, səh. 412; Dar əl-Kutub əl-İlmiyyə, Beyrut, 1417/1997; təhqiq: Mustafa Əbd əl-Qədir Ata*

[73] *Şəms əd-Din əz-Zəhəbi, Siyər əlam ən-nubəla, c.15, s.502-503; Muəssisə ər-Risalə, Beyrut, 1405/1985; təhqiq: Şueyb əl-Ərnaut*

[74] *http://az.313news.net/article/a-237.html*

[75] *Cəmal əd-Din əl-Mizzi, Təhzib əl-Kəmal, c.20, s.399; İbn Kəsir, əl-Bidayə və ən-nihayə, c.9, s.125; İbn Əsakir, Tarix Mədinəti Dəməşq, c.41, s.386*

***"Atam Əli ibn Hüseyn (ə) buyururdu: "Hüseyn (ə) və dostları üçün göz yaşı tökən hər möminə Allah-Təala Cənnətdə bir otaq verəcək. Düşməndən çəkdiyimiz əzab-əziyyətlərə görə göz yaşı tökən hər möminə Allah Cənnətdə gözəl yer verəcək!"***[76]

İmam Sadiq (ə) da öz atalarına tabe olaraq Kərbəla və Aşuranı əzəmətli tutmağa sifariş etmiş və buyurmuşdur:

**إنّ يوم عاشورا أحرق قلوبنا، وأرسل دموعنا، وأرض كربلاء أورثتنا الكرب والبلاء، فعلي مثل الحسين فليبك الباكون، فإنّ البكاء عليه يمحو الذنوب أيّها المؤمنون.**

***"Aşura hadisəsi qəlblərimizə od vurdu, gözlərimizin yaşını axıtdı. Biz Kərbəla qəm-qüssəsinin varisləriyik. Ağlayanlar Hüseyn (ə) kimisinə ağlasın! Çünki ey möminlər, ona ağlamaq günahları məhv edib aradan aparır."***[77]

---

[76] *Süleyman əl-Qunduzi, Yənabi əl-məvəddə, c.3, s.102; İbn Həcər əl-Əsqəlani, əl-İsabə, c.2, s.438; Lisan əl-mizan, c.2, s.451*

[77] *Əbu İshaq Əsfərayini, Nur əl-eyn fi məşhəd əl-Hüseyn (ə); s.84*

## Əzadarlıq barəsində səhabənin əməli üslubu

Əhli-sünnənin ədalətli bildikləri və onların hər işi əhli-sünnə üçün höccət hesab olunduqları səhabələr tərəfindən əzadarlıq məclislərinin qurulması İslamın əvvəlində əzadarlıqların mövcudluğuna daha bir dəlildir. Belə ki, bütün əzadarlıqlarda, xüsusilə Peyğəmbərin (ə) vəfatında Məkkə və Mədinə camaatı əzadarlıq keçirmiş, bu cür mərasimlərə bidət və s. gözü ilə baxmamışlar.

**1. Məkkə camaatının Peyğəmbərin (s) vəfatından sonra əzadarlıq etməsi**

Səid ibn Müsəyyibin dediyinə görə, Peyğəmbər (s) vəfat edən zaman Məkkə şəhəri camaatın ağlamaq və ah-nalə səslərindən lərzəyə gəlirdi.

**لما قبض النبی (ص) ارتجت مکه بصوت.**

> ***"Peyğəmbərin (s) vəfatı zamanı Məkkə şəhəri bütünlüklə ah-nalə səsinə bürünmüşdü."***[78]

**2. Peyğəmbərin (s) əzasında Aişənin və digər Mədinə qadınlarının əzadarlıq etmələri**

Aişə deyir:

**و قمتُ التدم (اضرب صدری) مع النساء و اضرب وجهی.**

> ***"(Peyğəmbərin (s) vəfatından sonra) ayağa qalxdım, gedib qadınlarla birlikdə sinəmə və üzümə vurmağa başladım."***[79]

**3. Həzrət Əlinin (ə) Məhəmməd ibn Əbu Bəkr üçün ağlaması**

"Təzkirə əl-xəvvas" kitabının müəllifi yazır:

**بلغ عليا قتل محمد بن أبي بكر فبكي وتأسف عليه ولعن قاتله**

> ***"Məhəmməd ibn Əbu Bəkrin ölüm xəbəri Əliyə yetişdikdə ağladı, onun ölümünə təəssüfləndi və onun qatilini lənətlədi."***[80]

**4. Numan ibn Muqrin üçün Ömərin ağlaması**

Numan ibn Muqrinin ölüm xəbəri Ömər ibn Xəttaba yetişdikdə Ömər onun üçün əlini başına qoyub ağlayırdı. İbn Əbi Şeybə "əl-Müsənnəf" kitabında yazır:

**عن ابي عثمان: اتيتُ عمر بنعی النعمان بن مقرن، فجعل يده علی راسه و جعل يبکی.**

> ***Əbu Osman deyir: "Numan ibn Muqrinin ölüm xəbərini Ömərə çatdırdım, o, bu xəbəri eşidəndə əlini başına qoyub ağladı."***[81]

**5. Xalid ibn Vəlid üçün qadınların ağlamasına Ömərin icazə verməsi və özünün də onlarla birlikdə əzadarlıq etməsi**

Hakim "əl-Müstədrək" kitabında yazır:

---

*[78] Muhəmməd əl-Fakihi əl-Məkki, Əxbaru Məkkə, c.3, s.80*

*[79] İbn Hişam, əs-Sirə ən-Nəbəviyyə, c.4, s.305*

*[80] Sibt ibn əl-Cəuzi, Təzkirə əl-xəvvas, s.102*

*[81] İbn Əbi Şeybə, əl-Müsənnəf, c.3, s.175 və c.8, s.21*

عن أبي وائل قال قيل لعمر بن الخطاب رضي الله عنه أن نسوه من بني المغيره قد اجتمعن في دار خالد بن الوليد يبكين وإنا نكره أن يؤذينك فلو نهيتهن فقال عمر ما عليهن أن يهرقن من دموعهن سجلا أو سجلين ما لم يكن لقع ولا لقلقه يعني باللقع اللطم وباللقلقه الصراخ

*Əbu Vail deyir: "Ömərə dedilər ki, Bəni Müğeyrə qəbiləsinin qadınları yığışıb Xalid ibn Vəlid üçün əzadarlıq edib ağlayırlar. Sənə əziyyət olar deyə bizim də bundan xoşumuz gəlmədi. Əgər mümkünsə, sən onlara bu işi qadağan et!" Ömər dedi: "Özlərinə vurub nalə etməyənədək bir neçə damcı gözlərindən yaş axıtmalarının eybi yoxdur."*[82]

"Əl-Əğani" kitabının müəllifi bu məsələyə əlavə də etmişdir:

عن أبي بكر الهذلي قال سمع عمر بن الخطاب نساء بني مخزوم يبكين على خالد بن الوليد فبكى وقال ليقل نساء بني مخزوم في أبي سليمان ما شئن فإنهن لا يكذبن وعلى مثل أبي سليمان تبكي البواكي

*Əbu Bəkr əl-Həzli deyir: "Ömər ibn əl-Xəttab Bəni Məxzum qəbiləsinin qadınlarının Xalid ibn Vəlid üçün ağlamaq səslərini eşidib ağlamağa başladı və dedi: "Qadınlara deyin ki, Əbu Süleyman (Xalid ibn Vəlid) haqqında nə bilirlərsə, etsinlər, lakin yalan danışmasınlar! Ağlayanlar Əbu Süleyman kimilərinə ağlasınlar!"*[83]

### 6. Ömərin ölümü ilə əlaqədar İbn Məsudun əzadarlıq etməsi

فوقف ابن مسعود على قبره يبكى

*"(Ömərin ölümündən sonra) İbn Məsud onun qəbrinin kənarında dayanıb ağladı."*[84]

### 7. Abdullah ibn Rəvahənin Həmzə üçün əzadarlıq etməsi

Abdullah ibn Rəvahə Həmzə üçün ağladı və onun üçün mərsiyə də yazdı.[85]

### 8. İmam Hüseynin (ə) şəhadət xəbərini eşidən zaman Mədinə camaatının ağlaması

İbn Cərir ət-Təbəri öz "ət-Tarix" kitabında belə nəql edir:

لما قتل عبيد الله بن زياد الحسين بن علي و جيء برأسه إليه دعا عبد الملک بن أبي الحارث السلمي فقال: انطلق حتي تقدم المدينه علي عمر بن سعيد فبشّره بقتل الحسين – وكان عمرو أمير المدينه –... قال عبد الملک فقدمت المدينه، فلقيني رجل من قريش فقال: ما الخبر؟ فقلت: الخبر عند الأمير؛ فقال إنا لله وإنا إليه راجعون؛ قتل الحسين بن علي.

فدخلت علي عمرو بن سعيد، فقال: ما وراءک، فقلت: ما سرّ الأمير؛ قتل الحسين بن علي؛ فقال: ناد بقتله، فناديت بقتله، فلم أسمع والله واعيه قط مثل واعيه نساء بني هاشم في دورهن علي الحسين...

*"Ubeydullah ibn Ziyad İmam Hüseyni (ə) şəhadətə çatdırandan sonra Həzrətin (ə) başını ona gətirdilər. İbn Ziyad Əbd əl-Məlik ibn Əbi əl-Haris əs-Silmini çağırıb dedi: "Mədinəyə get, Hüseynin (ə) öldürülməsi xəbəri ilə Əmr ibn Səidi (O zaman*

---

[82] *Hakim ən-Nisaburi, əl-Müstədrək əla əs-səhiheyn, c.3, s.336*
[83] *Əbu əl-Fərəc əl-İsfahani, əl-Əğani, c.22, s.98*
[84] *İbn Əbd Rəbbih, əl-İqd əl-fərid, c.4, s.283*
[85] *İbn Hişam, əs-Sirə ən-Nəbəviyyə, c.3, s.171*

*Mədinənin əmiri idi) müjdələ!" ... Əbd əl-Məlik deyir ki: "Mədinəyə çatdım. Qüreyşdən olan bir kişi ilə qarşılaşdım. O kişi dedi: "Nə xəbər var?" Dedim ki, "xəbər əmirdəndir." O, sözümün mənasını başa düşərək "Hamımız Allahınıq və Ona tərəf qayıdacağıq!" ayəsini söylədi və sonra dedi: "Hüseyn ibn Əli (ə) öldürülmüşdür."*

*Əmr ibn Səidin yanına daxil oldum. O, mənə dedi: "Arxandakı nədir elə?" Dedim: "Əmir üçün məxfi olan şey!" Hüseyn ibn Əli (ə) öldürülmüşdür. Mənə dedi ki, bu xəbəri yayım. Mən də bu xəbəri şəhər camaatı arasında yaydım.*

*And olsun Allaha ki, ömrümdə Mədinə qadınlarının nalələri kimi nalələr eşitməmişdim. Onlar öz evlərində Hüseyn ibn Əliyə (ə) əzadarlıq edib ağlayırdılar..."*[86]

[86] *İbn Cərir ət-Təbəri, ət-Tarix, c.3, s.342*

## Əhli-sünnədə əzadarlıq

**1. Ağlamaq və növhə demək barəsində bəzi əhli-sünnə alimlərinin nəzərləri**

Mövzunun əvvəlində ölən üçün ağlamağın bağışlanılmaz böyük günah olub-olmadığını bilməyimiz üçün ağlamaq və növhə demək barəsində olan əhli-sünnə alimlərinin rəylərini nəzərdən keçirəcəyik.

Muhy əd-Din ən-Nəvəvi "əl-Məcmu" kitabında ağlamağın haram olmasının məhdud olan yerlərini bir yerə toplamışdır:

1. Əhli-sünnə alimlərinin əksəriyyəti bu fikirdədir ki, ağlamaq və növhə deməyin haram olması o yerlərə aiddir ki, şəxs onun üçün ağlamanı və növhə oxumanı vəsiyyət etmiş olsun. Nəvəvi də bu rəyi qəbul etmişdir;

2. Bir qrup alim isə bu fikirdədir ki, ağlamaq və növhə deməyin haram olması o yerlərə aiddir ki, şəxs onun üçün ağlamanın və növhə oxumanın qarşısının alınmasını vəsiyyət etməmiş olsun;

3. Başqa bir qrup isə bu nəzəri qəbul edib ki, haramlıq o yerlərə aiddir ki, ölən üçün ağlayanlar onu şəriətdə qadağan olan sifətlərlə yad etsinlər. Məsələn, belə deyib ağlasınlar: "Ey övladlarını yetim qoyan! Ey qadınları dul qoyan! Ey abad evləri xaraba qoyan!";

4. Başqa bir qrup isə belə əqidədədirlər ki, meyit ailəsinin ağlamaq və nalə səslərini eşidəndə əzab çəkir və onların bu halına təəssüf hissi keçirir. Bu nəzər Məhəmməd ibn Cərir və Qazi əl-Əyyazın nəzəridir. Sonda isə ən-Nəvəvi bu nəzəri alimlərin icma etdiyi bir nəzər hesab edir:

**وأجمعوا كلهم على اختلاف مذاهبهم ان المراد بالبكاء بصوت ونياحه لا مجرد دمع العين.**

***"Bütün alimlər məzhəbləri fərqli olsa da, bu məsələdə icma etmişlər ki, haram hesab edilən ağlamaqdan məqsəd sadəcə göz yaşı tökmək deyil, əksinə, səs-küy salaraq növhə deyib ağlamaqdır."***[87]

Burdan da aydın olur ki, əhli-sünnə alimlərinin nəzərində sadəcə ağlamaq haram deyildir.

**2. Hicrətin 352-ci ilində İmam Hüseyn (ə) üçün əzadarlıq məclislərinin qurulması**

Əz-Zəhəbi "Vəqaye" kitabının şərhində 352-ci ilin əzadarlığını belə yazır:

**قال ثابت: ألزم معز الدوله الناس بغلق الأسواق ومنع الهراسين والطباخين من الطبيخ، ونصبوا القباب في الأسواق وعلقوا عليها المسوح، وأخرجوا نساء منشرات الشعور مضجات يلطمن في الشوارع ويقمن المآتم على الحسين عليه السلام، وهذا أول يوم نيح عليه ببغداد.**

***Sabit deyir: "Muizz əd-dövlə bazarların bağlanmasını əmr etdi. Dəyirmanlarda un üyüdülməsini və aşpazxanaların fəaliyyətini qadağan etdi. (Məmurlar) əzadarlıq bayraqlarını bazarlardan asdılar. Qadınlar baş-gözlərinə vura-vura saçları dağınıq***

---

[87] *Muhy əd-Din ən-Nəvəvi, əl-Məcmu, c.5, s.308*

*halda küçələrə tökülüşdülər, əzadarlıq edib növhə oxudular. Bu, Bağdad şəhərində əzadarlıqla bağlı birinci mərasim idi."*[88]

**3. Əhli-sünnə alimlərindən olan Sibt ibn əl-Cəuzinin vasitəsilə İmam Hüseynə (ə) əzadarlıq məclisinin təşkil edilməsi**

Digər tərəfdən də bəzi əhli-sünnə alimlərinin arasında İmam Hüseynə (ə) əzadarlıq etmələrinin şahidi də vardır.

İbn Kəsir "əl-Bidayə və ən-nihayə" kitabında belə yazır:

*Aşura günü camaat Sibt ibn əl-Cəuzidən istədi ki, minbərə çıxıb İmam Hüseynin (ə) şəhadətindən, onun keyfiyyətindən danışsın. O, bu istəyi qəbul edib minbərə qalxıb minbərə söykəndi. Uzun bir sükutdan sonra dəsmalı götürüb üzünə qoydu və şiddətlə ağlamağa başladı. Bu zaman ağlayaraq bu iki beyti söylədi:*

**ويل لمن شفعاؤه خصماؤه**

**و الصور فی نشرالخلایق ینفخ**

**لابد أن ترد القیامه فاطم**

**و قمیصها بدم الحسین ملطخ**

*"Vay o kəsin halına ki, şəfaətçisi onun düşməni olsun!*
*Qiyamət günü surətlərə üfürüləcək,*
*Sonda Fatimə (ə) məhşərə gələcək!*
*Hüseynin (ə) qanına bulaşmış paltarı geyinmiş halda!"*
*Sonra Sibt ibn əl-Cəuzi minbərdən enib göz yaşı tökərək evinə getdi.*[89]

**4. Əbd əl-Mömin (v. 346 h. q.) üçün əzadarlığın keçirilməsi**

Əbd əl-Mömin ibn Xələf Zahirilik məzhəbinin fəqihlərindən və Məhəmməd ibn Davudun ideoloji məktəbinin davamçılarından olmuşdur. Əbu Cəfər ən-Nəsəfi onun cənazə müşayiətinin və orda əzadarlıq keçirilməsini nəql etmişdir.[90]

**5. Əl-Cuveyni əş-Şafei (v. 478 h.q.) üçün əzadarlığın keçirilməsi**

Əz-Zəhəbi İmam əl-Hərəmeyn əl-Cuveyninin ölümü və onun üçün əzadarlığın keçirilməsi barədə belə yazır:

**فدفن بجنب والده، وكسروا منبره، وغلقت الأسواق، ورثي بقصائد، وكان له نحو من أربع مائه تلميذ، كسروا محابرهم وأقلامهم، وأقاموا حولا، ووضعت المناديل عن الرؤوس عاما، بحيث ما اجترأ أحد على ستر رأسه، وكانت الطلبه يطوفون في البلد نائحين عليه، مبالغين في الصياح والجزع.**

*"Onu atasının yanında dəfn etdilər. Əza məclisində onun minbərini sındırdılar. Bazarları bağladılar. Onun məclisində qəsidələr oxudular. Onun 400-ə yaxın tələbəsi var idi. O tələbələr bütün qələmlərini, mürəkkəb qablarını sındırdılar və bir il əza saxladılar. Onlar bir il başlarına bağladıqları çalmanı bağlamadılar. Bu işə o qədər israr etdilər ki, heç kəs başına çalma bükməyə cəsarət etmirdi. Bu müddətdə tələbələr*

---

[88] *Şəms əd-Din əz-Zəhəbi, Tarix əl-İslam, c.26, s.11*
[89] *İbn Kəsir, əl-Bidayə və ən-nihayə, c.13, s.207 (Hicrətin 654-cü ilin hadisələri)*
[90] *İbn Əsakir, Tarix Mədinə Dəməşq, c.10, s.272; Şəms əd-Din əz-Zəhəbi, Siyər əlam ən-nübəla, c.15, s.480*

*şəhərin küçə və bazarlarında gəzir, növhə oxuyur, ifrat dərəcədə qışqırıb dözümsüzlük göstərirdilər."*[91]

Əlbəttə ki, yuxarıdakı mətndə qeyd olunan tələbələrin əzadarlığı özü-özlüyündə təqdirəlayiqdir. Lakin onların bəzi ifrat dərəcədə gördükləri işlər qəbuledilməzdir. Minbəri, qələmlərini və mürəkkəb qablarını sındırmaları, bir il başlarına çalma bağlamamaları, hər kəsi bu işdən çəkindirmələri heç vaxt təqdirəlayiq hesab edilə bilməz. Bəlkə də, əz-Zəhəbi elə bu şeylərə görə öz nəzərini belə bildirmişdir:

**قلت: هذا كان من زي الأعاجم لا من فعل العلماء المتبعين.**

*"Nəzərim budur ki, bu cür işlər əcəmlərə aiddir, dinə tabe olan alimlər belə işləri etməzlər."*[92]

**6. İbn əl-Cəuzi (v. 654 h.q.) üçün əzadarlığın keçirilməsi**

Əz-Zəhəbi İbn əl-Cəuzinin ölümü haqqında yazır:

**وتوفي ليله الجمعه بين العشاءين الثالث عشر من رمضان...، وغلقت الأسواق، وجاء الخلق،... وكان في تموز، وأفطر خلق، ورموا نفوسهم في الماء... وباتوا عند قبره طول شهر رمضان يختمون الختمات، بالشمع والقناديل**

***"Sibt ibn əl-Cəuzi cümə gecəsi şam və işa namazları arasında, Ramazan ayının on üçü dünyadan köçmüşdür... Bazarlar bağlandı, bir çox insan onun yas mərasiminə gəldi... Camaatın çoxluğu, havanın çox isti olması camaatı oruclarını açmağa vadar etdi və bir çoxu özlərini istidən suya atdılar... Ramazan ayı boyunca camaat onun qəbrinin kənarında gecələdi, onun qəbrinin üstündə şam yandırıb Quran xətm etdilər. Şənbə günü əzadarlıq məclisi təşkil etdilər, onun barəsində çıxışlar olundu. Çox insan iştirak edirdi. Onun barəsində mərsiyələr oxundu..."***[93]

**7. Ömər ibn Əbd əl-Əzizin vəfatında (v. 101 h.q.) asimanın ağlaması!!!**

**عن خالد الربعي قال: مكتوب في التوراه إن السماء والأرض لتبكي علي عمر بن عبد العزيز أربعين صباحا!!!**

***Xalid ibn Rəbi deyir: "Tövratda yazılmışdır ki, göy və yer qırx gecə-gündüz Ömər ibn Əbd əl-Əziz üçün ağladı!!!"***[94]

**8. İbn Əsakirin vəfatında (v. 571 h. q.) asimanın ağlaması**

**قال ولده: وكان الغيث قد احتبس في هذه السنه؛ فدرّ وسحّ عند ارتفاع نعشه؛ فكأن السماء بكت عليه بدمع وابله واطشه.**

***Oğlu deyir: "Həmin il yağış yağmamışdı. İbn Əsakir vəfat edəndən sonra və cənazəsini yerdən götürəndə asiman yağmaq vəziyyətinə düşdü. Sanki bu yağış asimanın göz yaşları idi, belə ki, bol-bol və şiddətlə yağacağını göstərirdi."***[95]

---

[91] *Şəms əd-Din əz-Zəhəbi, Siyər əlam ən-nübəla, c.18, s.476*

[92] *Şəms əd-Din əz-Zəhəbi, Siyər əlam ən-nübəla, c.18, s.476*

[93] *Şəms əd-Din əz-Zəhəbi, Siyər əlam ən-nübəla, c.21, s.379*

[94] *Şuəyb əl-Hurəyfiş, ər-Rəvz əl-faiq, s.255; Əllamə əl-Əmini, əl-Ğədir, c.11, s.120*

[95] *Yaqub əl-Həməvi, Mucəm əl-udəba, c.4, s.41, "Bəlx tərəfdə 246-cı ildə görünməmiş qan yağdı", s.17*

### 9. Əhli-sünnə alimlərinin ikili standartlara uyğun reaksiyası

Bu qədər izahlı şəkildə sizə təqdim olunan mətləblərlə yanaşı necə olur ki, əhli-sünnə tarixçiləri İmam Hüseynə (ə) qurulan əza məclislərini öz kitablarında yazarkən özlərinin əks-reaksiyasını gizlədə bilmirlər?

Əz-Zəhəbi Bağdad əhalisinin İmam Hüseyn (ə) üçün əzadarlıq keçirmələrini nəql edərkən yazır:

**سنه اثنتين وخمسين وثلاثمئه: فيها يوم عاشوراء، ألزم معز الدوله، أهل بغداد بالنَّوح والمآتم، على الحسين بن علي رضي الله عنه، وأمر بغلق الأسواق، وعلّقت عليها المسوح، ومنع الطباخين من عمل الأطعمه، وخرجت نساء الرافضه، منشّرات الشعور، مضخّمات الوجوه، يلطمن، ويفتنّ الناس، وهذا أول ما نيح عليه،**

***"352-ci ilin hadisələri: Bu ilin Aşura günündə Muizz əd-dövlə Bağdad əhalisinə Hüseyn ibn Əli (ə) üçün matəm saxlamalarına göstəriş verdi. Əmr verdi ki, bazarları bağlasınlar, əza bayraqlarını assınlar, aşpazxanalar yemək bişirməsinlər. Şiə-rafizi qadınları saçları pərişan halda, üzlərinə vuraraq küçəyə çıxdılar, camaatı fitnəyə saldılar. Bu, Onun (ə) üçün keçirilən birinci əzadarlıq idi.***

**اللهم ثبت علينا عقولنا.**

***İlahi, bizim ağlımızı sabitqədəm elə"!***[96]

Əz-Zəhəbi başqa bir yerdə Aşura əzadarlığı barəsində yazır:

**أقامت الرافضه الشعار الجاهلي يوم عاشوراء**

***"Aşura günü rafizilər cahiliyyət şüarını ucaltdılar…"***[97]

**تمادت الرافضه في هذه العصر بعمل عاشوراء باللطم والعويل**

***"O dövrdə rafizilər Aşura günündə özlərini döymək, ağlamaq və nalə çəkmək kimi işlərin vasitəsilə öz azğınlıqlarını davam etdirdilər".***[98]

Əz-Zəhəbi hicrətin 388-ci ilin hadisələri barəsində belə yazır:

**وجعلت بإزاء يوم عاشوراء يوماً بعده بثمانيه أيام نسبته إلى مقتل مصعب بن الزبير، وزارت قبره بمسكن كما يزار قبر الحسين عليه السلام...**

***"Aşura gününün müqabilində ondan səkkiz gün sonra Müsəb ibn Zübeyrin ölüm gününü qeyd etdilər. İmam Hüseynin (ə) qəbrini ziyarət etdikləri kimi onun da qəbrini Məskin adlı bir yerdə ziyarət etdilər."***[99]

İbn Kəsir də bunun kimi bir fikir bildirmişdir:

**عملت الرافضه بدعتهم الشنعاء...**

***"Rafizilər öz pis bir bidətini (Aşura günü) yerinə yetirdilər."***[100]

Doqquzuncu əsrin əhli-sünnə alimlərindən olan Cəmal əd-Din Əbu əl-Məhasin Yusif ibn Təğribirdi əl-Utabəki Bağdad camaatının əzadarlıq keçirmələrini belə yazır:

---

[96] *Şəms əd-Din əz-Zəhəbi, əl-İbər fi xəbər min ğeyr, c.1, s.146*
[97] *Şəms əd-Din əz-Zəhəbi, Tarix əl-İslam, c.26, s.43*
[98] *Şəms əd-Din əz-Zəhəbi, əl-İbər fi xəbər min ğeyr, c.3, s.44*
[99] *Şəms əd-Din əz-Zəhəbi, Tarix əl-İslam, c.27, s.25*
[100] *İbn Kəsir, əl-Bidayə və ən-nihayə, c.11, s.302*

**السنه الثالثه من ولايه علي بن الإخشيذ على مصر وهي سنه اثنتين وخمسين وثلثمائه فيها في يوم عاشوراء ألزم معز الدوله الناس بغلق الأسواق ومنع الطباخين من الطبخ ونصبوا القباب في الأسواق و... المأتم على الحسين بن علي رضي الله عنه... وكل منهم رافضي خبيث**

***"Hicrətin 352-ci ili, Əli ibn Əl-Əxşidin hakimiyyəti. Bu ildə Aşura günü Muizz əd-dövlə camaata bazarların və aşpazxanaların bağlanmasını, matəm bayraqlarının bazarlarda asılmasını göstəriş verdi... Hüseyn ibn Əli (r.a) üçün matəm məclislərinin qurulmasını tapşıdı... Bunların hamısı xəbis rafizilərdir."*** [101]

Gördüyünüz kimi bu sünni alimləri İmam Hüseynin (ə) əzadarlıq məclislərinə qarşı bu qədər sərt olmalarına baxmayaraq öz sünni alimlərinin əzadarlığını, hətta asimanın onlar üçün ağladığını bu qədər rahatca öz kitablarında nəql edir, lakin sakitcə onların bu işini tənqid etmədən qırağa çəkilirlər. Görəsən niyə?

[101] *Cəmal əd-Din əl-Utabəki, ən-Nucum əz-zahirə, c.2, s.334*

## Araşdırmanın xülasəsi

Yuxarıda deyilənlərin hamısından bu nəticəyə gəldik ki, müsəlman meyit üçün ağlamaq, əzadarlıq etmək şəriətə müvafiq bir əməldir. Çünki Peyğəmbərimizin (s) simasında da bu əmələ şahid olduq. Lakin bəzi dar düşüncəli insanlar, əzadarlığı xurafat kimi anlayanlar qorxmadan öz əqidələrinə müxalif olan hər şeyi rədd edirlər. Deyilənlərdən bir neçə mətləbi nəticə olaraq qeyd edirik:

1. Yaxınlarının müsibətində ağlamaq bəyənilən bir işdir;

2. Peyğəmbərimizin (s) öz övladı İmam Hüseynin (ə) şəhadəti ilə bağlı əməli üslubu əzadarlığa "bidət" deyənləri yaxşıca öz yerində otuzdurur və onların bu fikrinin batil olmasına möhür vurur;

3. İnsan ruhunun lətifliyi, müsibətlərin qarşısında təsirlənməsi insanın fitri istəklərindəndir və Allah tərəfindən olan bir rəhmətdir.

Sonda bunu demək istəyirik ki, İmam Hüseynə (ə) əzadarlıq etmək İbn Teymiyyənin və onun tabeçilərinin dediyi kimi bidət deyil, əksinə, şiələrin nəzərində Qurana bərabər olan, onu təfsir edən Peyğəmbərin (s) pak Əhli-Beytidir (ə). Onlar o kəsdir ki, Peyğəmbər (s) sünnəsini bizə bəyan etmişlər. Onların sözləri bizim üçün şəri baxımdan höccətdir. Çünki Peyğəmbərimizin (s) onlar barəsində söylədiyi mütəvatir hədisi onların Qurandan ayrı olmadığını bizə çatdırır:

**أخبرني اللطيف الخبير أنهما لن يفترقا حتى يردا علي الحوض**

***"Allah mənə xəbər vermişdir ki, o ikisi (Quran və Əhli-Beytim (ə)) Kövsər hovuzunda mənə qovuşanadək bir-birindən ayrılmazlar."***

Buna əsasən də, Əhli-Beytdən (ə) bizə səhih sənədlə yetişən hər şey bizimlə Allah arasında şəri höccət olacaq, Qurana və Peyğəmbərin (s) səhih sənədlə buyurduğu sünnənin höccət olmasına əlavə olunacaq. Bizim şəhidlər sərvəri İmam Hüseynin (ə) əzadarlıq məclislərini əhəmiyyətli bilməmiz də belədir. Çünki məsum İmamlarımızdan (ə) mütəvatir şəkildə İmam Hüseyn (ə) üçün əza saxlamaq barədə olan hədisləri bizə gəlib çatmışdır.

Nəticədə şəriətin bizə hökmü budur ki, İmam Hüseynin (ə) əzadarlığını keçirmək, orada Peyğəmbərin (s) və məsum İmamların (ə) fəzilətlərini yad etmək, şəriət hökmlərindən danışmaq təkidli müstəhəbdir. Sonda da həmçinin Həzrətin (ə) müsibətlərini yad etmək və bu müsibətlərə ağlamaq təkidli müstəhəb olmasından əlavə Allah-Təalaya yaxın olmaq üçün ən fəzilətli əməllərdən hesab olunur.

Aləmlərin Rəbbinə həmd olsun!